“Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!” (Hicr/9)

“O, şübhəsiz ki, yenilməz (qiymətli) bir kitabdır. Nə öncə, nə də sonra batil ona yol tapa bilməz”. (Fussilət/41-42)

## MÜNDƏRİCAT

# GİRİŞ

İslamın Əhli-sünnə və Şiə firqələri Quranın təhrif olunmadığına dair həmfikirdirlər. Bəzi istisna, ittiham və anlaşılmazlıqları çıxmaq şərtilə bunu onların özləri də qəbul etmiş və edirlər. Hələ hicrətin dördüncü əsrində Əbülhəsən Əşəri (873-935) yazırdı ki, imamət və etizala bağlı olan, yəni ağlı bilik mənbəyi kimi qəbul edən və ya ədaləti üsuli-dinə daxil edən şiələrə görə, Quran nə azalıb, nə ona bir şey əlavə olunub, nə də dəyişikliyə məruz qalıb. (Əşəri Ə. "Məqalat əl-islamiyyin", 1/47) İmam Rəhmətullah Hindi (1818-1891) yazırdı ki, on iki imamçı şiə alimlərə görə, Quran təhrif olunmamışdır və Quranın azaldığını bildirənlərin sözləri məqbul deyildir. (Rəhmətullah Hindi M. "İzhar əl-Həqq", 3/928. Təəssüf ki, onun bu cümləsi, həmçinin Quranın təhrif edilmədiyinə dair Şiə alimlərindən gətirdiyi sitatlar Səudiyyə Ərəbistanına aid olan bu çapdan çıxarılmış, lakin onlayn kitabxana tərəfindən faylların haşiyəsinə yerləşdirilmişdir)

Misirin tanınmış Əhli-sünnə alimlərindən olmuş Əbu Zöhrə (1898-1974) özünün "İmam Sadiq" kitabında yazır: "Müsəlmanların yekdil rəyinə görə, Quran İslamın ilk mənbəyi, məxəzlər məxəzi və şəriətinin möhrüdür. Mövcud Quran kitabında onun hamısı var və Allah-Taala onu bu günə qədər qorumuşdur... Aralarındakı elmi əsas fərqlərinə rəğmən, on iki imamçı şiə qardaşlarımızın Qurana baxışı da bütün möminlərin baxışı ilə eynidir". (Əbu Zöhrə M. "Əl-İmam əs-Sadiq", 296)

Lakin sonradan meydana çıxıb müsəlmanlar arasında parçalanma yaratmağı qarşılarına məqsəd qoymuş bəzi vəhhabi sələfiləri hansısa uydurma hədislərdən və ya özləri kimi hədispərəst Əxbari alimlərindən bəhanə taparaq Əhli-beyt məzhəbinə iftiralar atmağa başlamış, bu mövzuda əsassız kitablar yazmışlar. Onlar Allah evinin ziyarətindən sui-istifadə edərək yalan və iftira dolu bu kitabları hacılar arasında pulsuz paylayır, şantajla məşğul olur, həmişə olduğu kimi, dini məlumatı zəif olan müsəlmanları sıralarına qatmağa çalışırlar.

**Mövzunun əhəmiyyəti**

Bu mövzu bəlkə də vəhhabilərin müsəlman firqələrinə yağdırdıqları tükənməz ittihamlardan yalnız biri kimi də görünə bilər. Lakin təəssüf ki, heç də sıradan bir ittiham deyil. Əvvəla, söhbət Quranın etibarından gedir. Əgər müsəlmanlar bir-birlərini onun təhrifində günahlandırsalar, bu müqəddəs kitab nəinki qeyri-müsəlmanların, hətta müsəlmanların da yanında hörmətdən düşər, ona inam azalar. İkinci məsələ isə Quranın təhrif olunduğunu düşünənlərin təkfir edilməsi ilə bağlıdır. Sələfilər belə bir düşüncəyə malik müsəlmanları kafir və mürtəd hesab edir, qətlini vacib sayırlar. Və şiələri belə bir etiqadda günahlandırmaq onların antişiə hərəkətlərinə, həmçinin qlobal güclərin İslam dünyasında iğtişaş və müsəlmanlar arasında təfriqə törətmə planlarına əlverişli şərait yaratmış olur.

Dövrümüzdə Əhli-beyt davamçılarını kafir sayan vəhhabi alimlərinin əsas dəlillərindən biri məhz bu qondarma iddia olmuşdur. Tanınmış vəhhabi müftisi İbn Cibrindən (1933-2009) yoxsul şiələrə zəkat verməyin hökmünü soruşduqda belə cavab vermişdi: “Kafirə zəkat verilməz. Şiələr də dörd dəlilə əsasən, kafirdirlər: 1. Onlar Quranın təhrif olunduğunu düşünürlər...” (İbn Cibrin A. “Əl-Lölö əl-məkin” fətvaları. Etiqadi suallar. Sual: 43. www.ibn-jebreen.com)

Bu ittihamı səsləndirən sələfi və vəhhabilərin sayı-hesabı yoxdur. Nümunə üçün deyək ki, Ehsan İlahi Zəhir (1941-1987) bu mövzuda "Şiə və Quran", Məhəmməd Malullah (1957-2002) "Şiə və Quran təhrifi", Nasir Qəfari (1956-) "Şiə məzhəbinin etiqadları", Məhəmməd Əs-Seyf "On iki imamçı şiəlik və Quran təhrifi", Osman əl-Xəmis (1962-) "Şiə və Quran" adlı əsərlər yazmış və bununla bütün dünyada Əhli-beyt davamçılarına qarşı terror əməliyyatlarının mental əsaslarını təmin etmişlər. Paralel olaraq, bəzi tanınmış terrorçular videomüraciətlərində şiələri təhrif düşüncəsində günahlandıraraq vəhhabiləri onlara qarşı döyüşə çağırmışlar. Milli vəhhabilərimiz də öz məsləkdaşlarından geri qalmayaraq sayt, forum və sosial şəbəkələrdə, həmçinin Youtube portalına yerləşdirdikləri dırnaqarası dərslərində "Şiə məzhəbinin ən böyük alimləri kafirdir", "Bu məzhəbi kafirlər qurmuşlar", "İslam düşmənlərini tanıyaq" kimi əxlaq və mədəniyyətdən kənar fikirlər səsləndirirlər.

Təəssüf ki, Əhli-beyt məzhəbinin əsasən Əxbari qoluna mənsub olan bəzi alimlər təhrif ittihamçılarını daha da cürətləndirmiş, öz əsassız fikirləri ilə onlara böyük fürsət açmışlar. Nemətullah Cəzairinin (1640-1701) bir neçə kitabda toxunduğu bu mövzu Hüseyn Nuri Təbrisinin (1838-1902) Quranın təhrifinə dair yazdığı bədnam kitabı ilə kulminasiya nöqtəsinə çatdı və bu günədək dartışılmaqda davam edir.

**İftira və ittihamlar**

Qabaqcadan qeyd edək ki, biz nə Şiə, nə Əhli-sünnə, nə də hətta Sələfi firqələrinin Quranın təhrifinə inandığını düşünmürük. Bütün firqələrdən bəzi alimlər bu fikirdə olmuşlar, lakin bu onların mənsub olduqları firqənin deyil, yalnız özlərinin subyektiv fikri sayılır.

Yeri gəlmişkən deyək ki, firqələri təhrif düşüncəsində ittiham etməmək fikri 2004-cü ildə əl-Müstəqillə telekanalında İmam Sadiqə həsr olunmuş silsilə diskussiyaların sonunda iştirakçılar tərəfindən də dəstəkləndi. Bu diskussiyada sələfilər tərəfindən küveytli əl-Xəmis,

ərəbistanlı Dusəri və Riyazdan telefon bağlantısı quran Məhəmməd Nüceymi, şiələr tərəfindən isə iranlı Musəvi, iraqlı Əsədi və Qumdan telefon bağlantısı quran livanlı Əli Kurani iştirak edirdi. Tanınmış aparıcı Məhəmməd Haşiminin səylərinə baxmayaraq, vəhhabilərin "diskussiyalar aslanı" Osman əl-Xəmisin sayəsində vahid bəyanat qəbul olunmadı. Çünki o, təhrif düşüncəsində olanların kafir elan edilməsinin bəyanata salınmasını da israrla tələb edirdi. Bununla yanaşı, iştirakçıların hamısı hər hansı firqəni təhrifdə günahlandırmağa son qoyulmasını və belə bir fikrin yalnız uyğun iddiaçıların özlərinə aid edilməsini dəstəkləyirdi. (Bax: www.youtube.com/watch?v=refWdNIPX_M) Lakin təəssüf ki, Osman əl-Xəmis bir qədər sonra yazdığı "Şiə və Quran" yazısı ilə bir daha bütün Əhli-beyt məzhəbini ittiham etməyə başladı. Biz burada yeri düşdükcə onun fikirlərini yada salacağıq.

Bu yazıda məqsədimiz kiməsə qarşı iddia qaldırmaq yox, Şiə firqəsinə atılan uyğun böhtanları cavablandırmaqdır. Bu gün Şiə dünyasında vəhdət çağırışları o qədər güclüdür ki, - təbii ki, bu çox yaxşı haldır - əksər ruhani və ilahiyyatçılar məzhəb mövzularına maraq göstərmir, bundan çəkinirlər. Bu amil, həmçinin "dini ədavət və düşmənçilik yaratmaq", "insanpərvərlik prinsiplərinə zidd olan dinlərin (dini cərəyanların) yayılması və təbliği" haqqındakı müvafiq qanunlarımızın işləməməsi normal ictimai varlıq kimi dinc birgəyaşayış mədəniyyətindən məhrum ünsürlərin və dini iğtişaşlara meylli radikal qrupların daha cəsarətlə meydan sulamasına səbəb olmuşdur.

Biz aşağıdakı qruplara bölünən iftira və iddiaların hər biri haqda ayrı-ayrılıqda danışacağıq:

1. Şiə kitablarında təhrifə dair 2000 səhih hədis var;
2. Şeyx Səduqdan qabaq heç bir Şiə imamı və ya alimi Quranın təhrif olunmadığını deməyib;
3. Şiələrdə fərqli bir Quran var;
4. Əksər Şiə alimləri Quranın təhrif olunduğunu söyləyiblər;

5. Quranın təhrif edildiyini düşünən hər kəs təkfir olunmalıdır, lakin Şiə alimləri bunu etmirlər;
6. Şiə etiqadları Qurana zidd olduğuna görə bu firqənin alimləri onun təhrif olunduğunu düşünürlər.

**Təhrif nədir?**

Mövzuya keçməzdən qabaq mübahisə predmetini dəqiq təyin etmək lazımdır. Ərəb-əcəmliyindən asılı olmayaraq, hər hansı insan "təhrif" deyəndə müxtəlif məsələləri nəzərdə tuta bilər. Konkret olaraq, Quran təhrifinin də müxtəlif növləri vardır ki, əsasən aşağıdakılardan ibarətdir:

**1. Mənəvi təhrif**

Bu təhrifdə söhbət Quranın söz və ya ayələrinin dəyişdirilməsindən, azaldılıb-artırılmasından deyil, yanlış izah edilməsindən, açıqlanmasından gedir. Mənəvi təhrif Quran təhrifinin ən geniş yayılmış növü olsa da, quranşünaslıqda danışılan təhrif bu deyil. Müsəlmanlar arasında çoxlu firqə və məzhəblərin mövcudluğu mənəvi təhrifə ən tutarlı dəlildir. Çünki Quranı hamı eyni cür başa düşüb təfsir və izah etsəydi, onu anlamada təhrifə yol verilməsəydi, asanlıqla ortaq məxrəcə gəlib birləşmək və parçalanmalara son qoymaq olardı. Bu gün isə hətta İslamdan çox uzaqlaşmış ən azğın və əsassız firqələr də etiqadlarını Quranla isbat etməyə çalışırlar.

Müsəlmanların yekdil rəyinə görə, Quranda bu təhrif baş vermişdir. Bəlkə də elə bir saat yoxdur ki, dünyanın harasındasa hansısa Quran ayəsi yanlış açıqlanıb mənən təhrif edilməsin.

**2. Tərtibatda təhrif**

Məşhur rəyə əsasən, Quran surələrində yer alan ayələrin düzülüşü Peyğəmbər tərəfindən həyata keçirilmiş, surələrin düzülüşü isə onun vəfatından sonra tərtib olunmuşdur.

Tərtibata aid olan başqa bir məsələ ayələrin sayı ilə bağlıdır. Bu haqda çoxlu fikir ayrılıqları vardır. Bu da Quranın azaldılıb-artırılması ilə deyil, vahid mətnin Cəbrayıl tərəfindən hansı hissələrlə gətirilməsi

və ya oxunması ilə bağlıdır. Hər halda, Quranın təhrifi deyəndə onun kitab kimi tərtibatında, ayələin sayında və ya surələrin düzülüşündə baş verən dəyişikliklər nəzərdə tutulmur.

**3. Qiraətdə təhrif**

Quranın müxtəlif qiraətləri – oxunuşları vardır və heç bir alim məşhur qiraətlər arasındakı fərqlərdən dolayı kimisə təhrifdə günahlandırmır. İslamın ilk əsrlərində çoxlu qiraətlər mövcud olmuş, sonradan isə onların arasından yeddisi məşhur qiraət kimi qəbul olunmuşdur. Məşhur qarilər avazla Quran oxuyanda bəzən müxtəlif qiraətlərə müraciət edib eyni ayəni fərqli formalarda oxuyurlar. Yeri gəlmişkən, deyək ki, hazırda oxunan və əlimizdəki Quranın tətbiq edildiyi ən düzgün və ən məşhur qiraət əsl Şiə qiraəti, bütün rəvayətçiləri şiələrdir. Onu Həfs öz atalığı Asimdən, Asim Əbu Əbdürrəhman Süləmidən, o da İmam Əlidən rəvayət etmişdir.

**4. Artırma təhrifi**

Müsəlmanların yekdil rəyinə görə, Allahın kitabına hər hansı əlavələrin edilməsi yolverilməzdir. Lakin Quranın bu növ təhrifə məruz qalmadığı heç kimdə şübhə doğurmadığı üçün mübahisə mövzusu da deyil.

**5. Azaltma təhrifi**

Bu növ təhrifdə söhbət Quranın bəzi hissələrinin Peyğəmbərin vəfatından sonra Qurandan çıxarılmasından gedir. Əhli-sünnənin Həşviyyə qolu və Şiəlikdə bəzi əxbari alimləri bu növ təhrifin baş verdiyini düşünürlər. Əhli-sünnənin ən məşhur səhih və sünən kitablarında, Şiənin də əsasən ikinci dərəcəli hədis kitablarında buna dair rəvayətlər mövcuddur. Lakin bu rəvayətlər ya zəif, ya da kiminsə səhvi və yanlış ictihadıdır.

İndi isə bir qədər yuxarıda sadaladığımız şübhələri araşdırmağa başlayırıq.

## BİRİNCİ FƏSİL: ŞİƏ HƏDİS KİTABLARINDA TƏHRİF MÖVZUSU

İlk dəfə Şiənin Əxbari qolunun nümayəndələrindən olmuş Nemətullah Cəzairi Quranın təhrifinə dair 2000 hədisin olduğunu bildirmiş, (Nuri H. "Fəsl əl-xitab", 198) daha ifratçı əxbari olan Nuri Təbrisi bədnam kitabında guya bu barədə olan 1000-dən artıq hədis toplamış, vəhhabilər də fürsəti fövtə verməyib onları araşdırmadan həvəslə təkrarlamağa başlamışlar. (Bax: Ehsan İlahi Zəhir. "Əş-Şiə və əl-Quran", 141-344) Müasir Vəhhabi alimlərindən olan Osman əl-Xəmis bu barədə 2000-ə yaxın hədisin olduğunu bildirərək bunu mütəvatir və ya mütəvatirə yaxın hesab edir. (Əl-Xəmis O. "Şiə və Quran". www.almanhaj.net) Çox böyük əksəriyyətinin təhriflə əlaqəsi olmayan bu 2000 hədisin hamısının səhih olduğuna dair gülünc iddia isə bizim bəzi yerli vəhhabilərimizə aiddir.

Əvvəla qeyd edək ki, hədis çox dəqiqlik tələb edən elmdir. Bu elmə dair güclü elmi əsasları, eləcə də tarix, rical və İslam hermenevtikası kimi elmlərdən məlumatı olmayanlar hədislərin nə səhihliyini təyin edə, nə mənasını tam açıqlaya, nə də onlar arasında ziddiyyəti çözə bilərlər. Firqə və məzhəblərin tarixini və Əhli-beyt imamlarına dair ğülüvv – ilahiləşdirmə, şişirtmə amilini nəzərə alsaq, etiqada dair hədislərin daha mürəkkəb və daha əhəmiyyətli olduğunu söyləyə bilərik. Bəzən imamların, yaxud onların yaxın səhabələrinin yanında görünməyə çalışan ğalilər – Allaha xas atributları imamlara aid edənlər ya xəstə təfəkkürlərindən, nadanlıqlarından dolayı, ya da özlərini böyütməkdən ötrü Əhli-beyti ilahiləşdirən rəvayətlər

uydurur, hətta bəzən belə rəvayətlərə səhih rəvayət sənədi düzəldib səhabələrin hədis toplularına yerləşdirirdilər. İmamı ilahiləşdirəndən, rəbb kimi göstərəndən sonra, təbii ki, bundan onlara da müəyyən pay düşür, özlərini Əhli-beytin xüsusi nümayəndəsi və sözçüsü kimi təqdim edirdilər. İmamların adlarının Qurandan çıxarıldığını göstərən hədislər də məhz bu cərəyanın uydurmasıdır. Bu haqda danışacağıq.

Təbii ki, ğülüvv amili təkcə Şiəyə xas deyil. Peyğəmbərin vəfatından sonra xəncərini çəkərək "Allahın rəsulu ölməz!" deyən və onun öldüyünü söyləyənləri münafiq adlandıran (Təbəri M. Tarix, 3/200-201) təfəkkür tərzini Peyğəmbəri fövqəlbəşəri varlıq kimi göstərməyə ilk cəhd hesab etmək olar.

Şiə məktəbinin özəlliyi budur ki, onda Səhih adlı kitab yoxdur, doqmatizm, ehkamçılıq məqbul sayılmır. Sələfilikdən fərqli olaraq, bu firqədə qədim alimlərin sonrakılardan daha ağıllı olduğu, daha düzgün düşündüyü söylənmir. Əksinə, bütün elmlər, o cümlədən hədis elmi get-gedə inkişaf edir və bu inkişafın əsas amillərindən biri də tənqiddir.

Dörd əsas hədis kitabı – Kafi, Fəqih, Təhzib, İstibsar və hətta Nəhcül-bəlağə Şiənin mötəbər mənbələri sayılır, lakin bir kitabın mötəbər sayılması onun bütün hədislərinin səhih olması demək deyil. Biz heç bir hədisşünasa, heç bir alimə gözüyumlu etimad etmir, heç bir alimin hədislərə dair mövqeyini son söz saymır, elmi əsas və dəlilləri araşdırmağı vacib bilirik. Zatən, səhih hədis kriteriyaları da eyni deyil və alimlər arasında buna dair fərqli meyarlar vardır. Bu baxımdan, əl-Kafi ilə Səhih Buxari arasında heç bir fərq yoxdur. Biz hər iki kitabda səhih, zəif və hətta qondarma (uydurulduğu sübut olunmuş) hədislərin olduğunu düşünür, hər hansı hədisin sənəd (rəvayətçilər silsiləsi) və mətnini, eləcə də onunla bağlı tarixi və digər məlumatları araşdırıb yekun nəticə çıxarır, elmi nəticə kimi arxasında dayanır, fikrimizi müdafiə edir, tənqidlərə cavab verir və "bu hədis Buxaridəndir (və ya Kuleynidəndir)" deyib yaxamızı kənara çəkmirik. Bu baxımdan, hər hansı hədis həqiqətən Quranın təhrif olunduğuna

dəlalət etsə, onun sənədini araşdırmağa ehtiyac görmədən Quranın dəyişməzliyinə dair ayələri önə keçirir və çəkinmədən hədisi rədd edirik.

Konkret olaraq, “təhrif” hədislərinə gəldikdə isə, təəccüb və təəssüf dolu iki məqama toxunmaq istəyirik. Biri əxbari şiələrdən olan Nuri Təbrisinin nəyin bahasına olursa-olsun, hətta kitabını təhriflə əlaqəsi olmayan hədislərlə doldurmaqla olsa belə, hamını Quranın təhrif olunduğuna və tarix boyu əksər Şiə alimlərinin bu fikirdə olduğuna inandırmaq cəhdi, ikinci məqam isə vəhhabi alimlərinin Nuriyə güclü dəstək verməsi, onun fikir, dəlil və hətta metodlarını təsdiqləməsidir. Nurinin topladığı 1062 “təhrif” hədisini üzündən köçürərək kitabının üçdə ikisini – 205 səhifəsini doldurmuş Ehsan İlahi Zəhir də bütün bu rəvayətləri Quran təhrifinə dəlil hesab etmişdir. Halbuki Quran tarixi və qiraət elmi ilə az-çox tanış olan heç kəs onların çox böyük əksəriyyətinin qiraət fərqlərinə, əlavə təfsir və izahların çıxarılmasına, mənəvi və ya tərtibatda təhrifə aid olduğuna şübhə etməz. Daha maraqlısı isə odur ki, bu rəvayətlərin bəzisi Əhli-sünnə mənbələrindən Şiə kitablarına yol tapan rəvayətlərdir və cənab İlahi Zəhir onların hamısından şiələrə tənə üçün istifadə etmişdir.

### 1. 1. Əl-Kafi və təhrif hədisləri

Hər bir hədis toplusu kimi əl-Kafi də tənqidə açıqdır. Biz əxbarilərdən fərqli olaraq, bu kitabın hamısını səhih saymır, onda zəif və hətta qondarma hədislərin olduğunu qəbul edirik. Necə ki, əhli-sünnə qardaşlarımızın, həmçinin sələfilərin ən mötəbər səhih kitablarında da vəziyyət belədir. Bu baxımdan, hansısa bir kitabda bir neçə hədis görən kimi onu uyğun firqənin etiqadı saymaq olmaz. Şiəliyə qarşı belə bir iddia isə əsla mümkün deyil. Ona görə ki, bu firqədə Qurandan başqa heç bir kitaba səhih statusu verilməyib.

Guya İmam Mehdinin kiməsə “Kafi şiələrimizə kifayətdir” deməsinə gəlincə isə, bu tamamilə əsassız iddiadır. Bunu hətta əsrlər öncə Əllamə Məclisi də təsdiqləmişdir. O yazır: “Əsassız danışmağı

sevən bəzi adamlar şübhə etmirlər ki, bütün Kafi kitabı İmam Mehdi tərəfindən təsdiqlənmişdir”. (Məclisi M. “Mirat əl-üqul”, 1/22)

Mühəddis Nuri kimi əxbarilər, həmçinin Ehsan İlahi Zəhir, Malullah, Qəfari və əl-Xəmis kimi vəhhabilər Quranın təhrif olunmasına dair əl-Kafi kitabının 80-dən bir qədər artıq hədisinə istinad etmişlər. Halbuki onların bəzisi Quranın mənaca təhrif olunmasına, bəzisi ayələrdən əlavə təfsirlərin çıxarılmasına, bəzisi qiraət fərqlərinə aiddir, bəzisinin təhriflə yaxından-uzaqdan heç bir əlaqəsi yoxdur, bəzisi isə kitabın nüsxələrində getmiş səhvlə bağlıdır. Biz bu hədisləri aşağıdakı qruplara bölüb hər biri haqda ayrıca danışmaq istəyirik:

### 1. 1. 1. Bütün Quranı mənimsəmək hədisləri

Əl-Kafinin Höccət kitabının “İmamlardan başqa heç kəs Quranın hamısını mənimsəməmişdir” babında 6 hədis yer almışdır ki, bəzən onları Quranın təhrifinə aid edirlər. Halbuki “Əli ibn Əbu Talibdən və digər imamlardan başqa heç kəs Quranı Allahın nazil etdiyi kimi cəm etməmiş (mənimsəməmiş) və qorumamışdır” (Kuleyni M. Əl-Kafi, 1/228) kimi hədislərin təhrifə - Quranın azalmasına aidiyyəti yoxdur. Əslində, məqsəd Quranın əsl mahiyyətini, həqiqətini, eləcə də ən düzgün qiraətini mənimsəmək, əsl məna və məzmununun itib-batmasına qoymamaqdır. Bu fikir Şiə etiqadlarına da uyğundur. Əhli-beyt məzhəbinə görə, Quranın bütün sirlərini, sətiraltı mənalarını, gizli və açıq mesajlarını tam şəkildə yalnız Peyğəmbər və Əhli-beyt imamları mənimsəyə bilərlər. Ən qədimdən Şiə etiqadı belə olmuş və imamlar uyğun məzmunda sözlər deyəndə də məhz bu şəkildə başa düşülmüşdür. Təbii ki, kimsə bu düşüncəni qəbul etməyə bilər, lakin indi mövzu bu deyil. Mövzu bu kimi hədislərin Quranın təhrifinə dəlalət edib-etməməsidir və göründüyü kimi, burada təhriflə - Quranın söz və ya ayələrinin azaldılması ilə bağlı heç nə yoxdur.

### 1. 1. 2. Səhifə, Cifr, Camiə və Fatimə müshəfi hədisləri

Bəzi hədislərə görə, Əhli-beyt imamlarında Səhifə, Cifr, Camiə və Fatimə müshəfi adlı kitablar vardır. Bəzi sələfilər bunları Quranın təhrifi kimi göstərməyə çalışırlar. Halbuki bu kitabların Quranla heç bir əlaqəsi yoxdur. Höccət kitabının uyğun babında qeyd olunmuş 8 hədisdə (Kuleyni, 1/238-242) də göstərilir ki, bu kitablar keçmiş peyğəmbərlərə göndərilən kitab və səhifələrdən, Fatimeyi-Zəhranın vəsiyyətindən və ya Peyğəmbərin vəfatından sonra bir mələyin (yaxud Cəbrayılın) təsəlli olaraq ona dediyi sözlərdən, gələcəkdə qarşıya çıxacaq dini məsələlərə cavabları, gələcək hadisələri və digər elmləri ehtiva edən kitablardan ibarətdir. Biz indi bu hədislərin doğru və ya yanlış olduğunu, yaxud hansısa rəmzi məna daşıdığını araşdırmırıq. Əslində, bunları Quranın təhrifinə dəlil kimi bayraq edən milli və əcnəbi vəhhabilərə demək istəyirik ki, bu hədislər Quranın təhrifi ilə bağlı hər hansı mövqe ortaya qoymur. Bundan əlavə, hansısa mələyin və hətta Cəbrayılın Fatimə ilə danışmasının da vəhy və Quranla əlaqəsi yoxdur və hədislərdə belə bir iddia mövcud deyil.

Burada insanları çaşdıracaq məsələ Fatimə müshəfi ilə bağlı ola bilər. Qeyd etməliyik ki, "müshəf" sözü ərəbcə səhifələnmiş toplu, kitab deməkdir. O zaman səhabələrin topladığı Quran kitablarına da müshəf deyilirdi: məsələn, İmam Əlinin müshəfi, Abdullah ibn Məsudun müshəfi və sair. Bu baxımdan, Fatimə müshəfi deyəndə kimsə Fatimeyi-Zəhranın topladığı Quran kimi başa düşə bilər. Digər tərəfdən, "Fatimə müshəfi Qurandan üç dəfə artıqdır və onda bir Quran sözü də yoxdur" (Kuleyni, 1/239) hədisini görəndə də fərqli bir Quran olduğunu anlayar. Halbuki tarix və hədis mənbələrində Fatimeyi-Zəhranın Quran topladığı və özünün müshəfi olduğu haqda məlumat verilmir. Bu kimi hədislərdə sözü keçmiş Fatimə müshəfinin isə Quranla əsla əlaqəsi yoxdur. Bu elə hədislərin özündən, "onda bir Quran sözü də yoxdur" və digər bu kimi ifadələrdən açıq görünür. Qurandan, bəzən də konkret adları olan İncil və Tövratdan başqa bir kitab görməyənləri başa düşmək olar, bugünkü gündə bunu

anlamayıb haray-həşir salanlara isə savadsızlıqlarından dolayı ancaq təəssüf etmək olar.

Osman əl-Xəmis əl-Kafinin sonuncu cildini ehtiva edən Rövzə əl-Kafi hissəsində - xatırladaq ki, bu hissə digər hissələr qədər mötəbər deyil – mövcud olan bir hədisə əsasən, Fatimə müshəfinin Quran olduğunu iddia edir. (Əl-Xəmis O. "Əş-Şiə və əl-Quran". www.almanhaj.net) Bu hədisə əsasən, İmam Sadiq Məaric surəsinin 2-ci ayəsini "bi vilayəti Əliyyin" əlavəsi ilə oxuyaraq buyurub ki, Allaha and olsun, Fatimənin müshəfində də belə qeyd olunub. (Kuleyni, 8/57-58) Göründüyü kimi, bu hədis Fatimə müshəfinin Quran olduğuna dəlalət etmir. Dünyada hansısa normal hüquqşünasın, hermenevtikin və ya linqvistik ekspertin də belə düşünəcəyini zənn etmirik. Bu hədis sözügedən ayənin "Fatimə müshəfi" adlı bir kitabda bu təfsirlə qeyd olunduğunu bildirir, kitabın isə təfsir, fiqh, kəlam və ya başqa bir mövzuda olduğuna dair hər hansı bilgi ortaya qoymur. "Bi vilayəti Əliyyin" hissəsi isə heç şübhəsiz, əlavə təfsirdir və biz aşağıda bu haqda danışacağıq.

### 1. 1. 3. Əlavə təfsirlərin çıxarılması

Mübahisəli hədislərin bir qismi bəzi ayələrin içində qeyd olunan əlavə təfsirlərlə bağlıdır. Əhməd ibn Məhəmməd deyir: "Əbülhəsən (İmam Kazim) mənə bir müshəf (kitab və ya Quran) verib dedi ki, buna baxma. Mənsə açıb bunları oxudum: Kitab əhlindən kafir olanlar və müşriklər... (Bəyyinə/1) Mən orada Qüreyşdən 70 nəfərin adını gördüm". (Kuleyni, 2/631) Göründüyü kimi, bu hədisdə Quranın təhrifinə işarə belə yoxdur. Harada deyilir ki, bu adlar Quranın tərkib hissəsi imiş?! Biz bilirik ki, İmam Əlinin topladığı Quranda qısa təfsirlər də olmuşdur. Bəlkə həmin kitab İmam Əlinin Quranı və bu adlar da təfsir olub. Yəni hədisin düz-səhvliyindən asılı olmayaraq, burada 70 adın Quranın tərkib hissəsi olduğu söylənmir.

Yeri gəlmişkən, deyək ki, bu növ təfsirlərə işarə vuran hədislər çoxdur. Oxşar rəvayətlər qeyri-şiə mənbələrində də var. Məsələn,

çoxlu səhabə və katiblərin dediyinə görə, Xanım Aişənin müshəfində Bəqərə surəsinin 238-ci ayəsinə "və əsr namazı" əlavə olunmuşdu, onun üçün Quran köçürənlərə tapşırırmış ki, bu hissəni də ayəyə yerləşdirin, çünki Peyğəmbərdən belə eşitmişəm. (İbn Əbu Davud A. Əl-Məsahif, 208-211) Böyük ehtimalla Peyğəmbər sözügedən hissəni təfsir məqsədilə söyləyib və Aişə ya onun ayənin tərkib hissəsi olduğunu zənn edib, ya da elə təfsir kimi Qurana salınmasını söyləyib. Xatırladaq ki, Peyğəmbərin digər xanımları Həfsə və Ümm Sələmənin də bu ayəni eyni əlavə ilə yazdırmaları nəql olunmuşdur. (Yenə orada, 211-218)

Yaxud İbn Məsud deyir ki, biz Peyğəmbərin dövründə Maidə surəsinin 67-ci ayəsini belə öyrədirdik: "Ey Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni təbliğ et - ki, Əli möminlərin mövlasıdır. - Əgər (bunu) etməsən, (Allahın) risalətini yerinə yetirmiş olmazsan". (Süyuti C. "Əd-Durr əl-mənsur", 3/117) Göründüyü kimi, "ki, Əli möminlərin mövlasıdır" hissəsi ayədən deyil, onun təfsiridir. Bir ayənin tilavəti və ya təlimi əsnasında da hər hansı açıqlama verməyin heç bir eybi yoxdur. Üstəlik, erkən İslam çağında Quran öyrətmək, Quran dərsi keçmək onu yalnız üzündən oxumaq və ya oxutdurmaqdan deyil, həm də açıqlamalarını, təfsirini bəyan etməkdən ibarət idi.

Bundan əlavə, bəzi Əhli-sünnə təfsirlərinin yazdığına görə, Abdullah ibn Məsud Ali-İmran surəsinin 33-cü ayəsini "və alə Muhəmməd" əlavəsi ilə oxuyurmuş. (Əbu Həyyan Andalusi M. "Əl-Bəhr əl-muhit", 3/111) İbn Abbasın və Qətadənin rəvayətinə əsasən, Übəy ibn Kəbin qiraətində Nisa surəsinin 24-cü ayəsində mütə nikahına dəlil olan "ila əcəlin musəmma" hissəsi vardır ki, bu gün əlimizdə olan Quranda mövcud deyil. (Təbəri M. Təfsir, 8/177-178, h: 9036-9041; İbn Əbu Davud, 164) Hətta ən güclü quranşünas səhabələrdən olan İbn Abbas 3 dəfə Allaha and içərək bu hissənin Qurandan olduğunu bildirmişdir. (Təbəri. Təfsir, 8/177-178, h: 9038-9041)

Mühəddis Nuri öz kitabında bu kimi rəvayətləri də Quranın təhrifinə dəlil kimi qeyd etmiş, sələfilər də bundan Şiə əleyhinə sui-istifadə etmişlər. Halbuki bu növ rəvayətlərdə mövcud olan və bugünkü Quranda yer almayan hissələrin Quran sözü deyil, Cəbrayıl tərəfindən çatdırılmış əlavə izah olmasını Əhli-sünnə alimləri də qəbul edirlər. Süyuti (1445-1505) İbn Abbasın Bəqərə surəsinin 198-ci ayəsinə "həcc mövsümlərində" ifadəsini artırmasını (Buxari M. Əs-Səhih, 2/181-182, 3/53, 3/62, 6/27) da məhz əlavə təfsir kimi izah etmişdir. (Süyuti C. "Əl-İtqan fi ülum əl-Quran", 1/265) Qurtubi deyir ki, səhabə və tabeilərin bəzi ayələri müəyyən əlavələrlə oxumaları açıqlama və təfsirlə bağlıdır, həmin əlavələrin Quranın tərkib hissəsi olması demək deyil. (Qurtubi M. Təfsir, 1/86) Əsasən izah məqsədilə səhabələr tərəfindən əlavə təfsir və ya duaların qiraətə daxil edilməsini digər Əhli-sünnə alimləri də qəbul edirlər. (İbn əl-Cəzri M. "Ən-Nəşr fi əl-qiraat əl-əşr", 1/32; Zərkəşi M. "Əl-Burhan fi ülum əl-Quran", 2/127-128) Və burada ortaya belə bir sual çıxır: səhabələr barədə bu qədər müsbət və nikbin yanaşmaların olduğu halda, nə üçün növbə Əhli-beyt imamlarına – Peyğəmbər övladlarına çatanda oxşar təfsirləri Quranın tərkib hissəsi kimi qəbul edib böhtan və iftiralar yağdırır, Şiə məzhəbini təhrif düşüncəsində ittiham edirlər?! Bəzi sələfilərin belə ikili yanaşmasına, bu gün də utanmadan "Şiə kitablarında Quranın təhrifinə dair 2000 hədis var" söyləməsinə nə ad vermək olar?!

Şiə və Sünni rəvayətlərində mövcud olan bu növ əlavələr ya Cəbrayıl tərəfindən Quran deyil, qüdsi hədis kimi və təfsir məqsədilə nazil olub, ya da səhabələr izah kimi Peyğəmbərdən belə eşitmişlər. Bəzi hədislərdə deyilmiş "belə nazil olub" ifadəsi birinci versiyanı gücləndirir.

Yeri gəlmişkən, deyək ki, tənzil və nazilolmada məqsəd ayənin zahiridir: sözlərindən başa düşülən leksik mənası və ona uyğun təfsiri. Təvil isə zahiri və sözləri ilə çox da uyğunluğu olmayan batini mənasıdır. Hədisdə göstərilir ki, hər bir ayənin zahiri və batini vardır. (Zərkəşi, 2/154) Zahiri sözlərlə və nazilolma səbəbi ilə birbaşa əlaqəsi

olmayan batini məna təvillə əldə olunur, təfsir isə Quranın zahiri və tənzili ilə bağlıdır. İmam Baqir buyurub: “(Quranın) zahiri tənzili, batini isə təvilidir”. (Hürr Amili M. “Vəsail əş-Şiə”, 27/196) Bu baxımdan, bəzi hədislərdə işlənmiş “belə nazil olub”, yaxud “tənzili belədir” ifadəsi təvil qarşısında işlənib ayənin sözlərinə, nazilolma səbəbinə və ya sözlərindən başa düşülən təfsirinə aid edilə bilər. Bu növ hədislərdə Qurandan olmayan əlavələr üçün qeyd olunmuş bu ifadə məhz onun təfsirinə və ya nazilolma səbəbinə aiddir. Bunu əl-Kafinin şərhçiləri də təsdiqləyirlər. Misal üçün, Feyz Kaşani bir hədisdə İmam Sadiqin Əhzab surəsinin 71-ci ayəsini oxuyarkən “Əlinin və sonrakı imamların vilayəti haqda” hissəni artırıb “belə nazil olub” deməsi barədə yazır: “Yəni bu mənada nazil olub. Buna bənzər ifadələrdə məqsəd budur”. (Feyz Kaşani M. Əl-Vafi, 3/885) Yaxud Molla Saleh Mazandarani bir yerdə “belə nazil edilib” sözünü şərh edərkən yazır ki, bu, qeyd olunan əlavənin Quran olması demək deyil. Çünki vəhy zamanı Peyğəmbərə nazil olan sözlər Quran da ola bilər, əlavə izah və təfsir də. (Mazandarani M. “Şərh əl-Kafi”, 7/74) "Onu (Quranı sənin qəlbində) cəm etmək, (dilində) oxutmaq Bizə aiddir. Biz onu (Cəbrayılın dili ilə) oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə. Sonra onu (sənə) bəyan etmək də Bizə aiddir!" (Qiyamət, 17-19) ayələrinə əsasən, bunu Bəyan və açıqlama vəhyi də adlandırmaq olar. Ayədən göründüyü kimi, Qurana aid olmayan bəzi əlavə izahlar da Cəbrayıl vasitəsilə Peyğəmbərə nazil olmuşdur və bu növ hədislərdə məhz həmin əlavələr nəzərdə tutulur. İddianın isbatı üçün “O, kefi istəyəni danışmır. O (onun sözləri), ancaq nazil olan bir vəhydir” (Nəcm/3-4) ayələrinə də istinad etmək olar.

Bəzi hədislərdə ayəyə edilən əlavə isə təfsir deyil, təvil xarakteri daşıyır. Nümunə üçün, İmam Sadiq Zümər surəsinin 8-ci ayəsini batini məna və təvil olaraq İmam Əli ilə əlaqələndirdikdən sonra deyir: “Ey Əmmar! Bu, ayənin təvilidir”. (Kuleyni, 8/204-205)

### 1. 1. 4. İmamlarda olan fərqli Quran

Bir çox hədislərdə İmam Əlinin topladığı Quranın indiki Qurandan fərqli olduğu və İmam Mehdi gələndə həmin Quranı aşkara çıxaracağı deyilir. (Kuleyni, 2/633) Əslində burada da anlaşılmaz bir şey yoxdur. Tarix və hədis qaynaqlarından bəllidir ki, Peyğəmbərin vəfatından sonra toplanmış ilk Quran kitabında (İbn Nədim M. Əl-Fihrist, 1/45-46) – yəni İmam Əlinin müshəfində surələr tarixi ardıcıllıqla düzülüb: Ələq, Müddəssir, Qələm, Müzzəmmil, Təbbət, Təkvir və s. (Süyuti. Əl-İtqan, 1/216) Müxtəlif səhabələrin topladığı Quran kitablarında surələrin fərqli düzülüşü də göstərir ki, ayələrdən fərqli olaraq, surələrin düzülüşü Peyğəmbər tərəfindən təyin olunmayıb. Bu baxımdan, İmam Əlinin müshəfindəki əsas fərq onun ayələrinin az-çoxluğunda deyil, yalnız surələrinin düzülüşündədir və yuxarıda dedik ki, bu, Quranı təhrif etmək sayılmır. Bundan əlavə, imamın topladığı Quranda möhkəm və mütəşabih, nasix və mənsux ayələr, habelə bəzi əlavə təfsir və təvillər yer almışdır.

### 1. 1. 5. Mənəvi təhrif

Quranın təhrifinə dəlalət etdiyi iddia olunan digər hədislər yalnız mənəvi təhrifi nəzərdə tutan rəvayətlərdir. İmam Kazimin Əli ibn Süveydə yazdığı məktubunda keçmiş təhrif və dəyişdirmə ifadələri də məhz məna və təfsirdə təhrifə aiddir. Bu hədisə görə, İmam Kazim belə yazmışdı: “Allahın kitabı bu insanlara əmanət verildi, onlarsa onu təhrif edib dəyişdirdilər”. (Kuleyni, 8/125) Hər bir imam kimi, İmam Kazim də mövcud Quranda İmam Əlinin və Əhli-beytin vilayətinə - rəhbərliyinə işarə vuran ayələrin olduğunu bilirdi. Onun məqsədi bu ayələrin fərqli şəkildə təfsir olunmasıdır ki, bunun başqa bir adı mənəvi təhrifdir.

İmam Baqirin “bütün ayələrimizi yalanladılar” (Yenə orada, 1/207) hədisi də Əhli-beytə aid ayələrin ya bilərəkdən, ya da bilmədən yanlış izah edilməsinə, mənaca təhrif olunmasına etirazdır. “Peyğəmbər (qiyamət günü) “Ey Rəbbim! Həqiqətən, qövmüm bu Quranı tərk etmişdi!” – deyəcək” (Furqan/30) ayəsi də oxşar məzmunu

ifadə edir. Burada Peyğəmbərin məqsədi Quranı qəbul etməmək, onun yazı və vərəqlərindən uzaqlaşmaq deyil, buyruqlarına əməl etməmək, onunla yaşamamaq olduğu kimi, sözügedən hədislərdə də məqsəd Quranın ayə və surələrini dəyişdirmək deyil, mənasını təhrif etmək və nəticədə, ondan uzaqlaşmaqdır. İmam Baqirin "(Allahın) kitabından üz çevirməyin bir növü belədir ki, hərflərini qoruyub, hədlərini (mənalarını) təhrif edirlər" (Kuleyni, 8/53) hədisi bunu daha aydın göstərir.

### 1. 1. 6. Quranın üç və ya dörd hissədən ibarət olması

Təhriflə bağlı olduğu iddia edilən bəzi rəvayətlər Quran ayələrini üç və ya dörd hissəyə bölən rəvayətlərdir. Nümunə üçün, əl-Kafidə mövcud olan 3 belə hədisin birini qeyd edirik: Əsbəğ ibn Nübatə deyir ki, Əmirəlmömininindən belə eşitdim: "Quran üç hissədən ibarətdir: biri biz və düşmənlərimiz barədə, biri sünnə və məsəllər, biri isə vacib və digər hökmlərdir". (Kuleyni, 3/627)

Təhrif iddiaçılarına görə, əlimizdəki Quranın üçdə biri Əhli-beyt və onların düşmənləri barədə olmadığı üçün, bu hədisə əsasən, təhrif olunmuş sayılır. Halbuki hər hansı bir şeyi müxtəlif hissələrə bölmək həmin hissələrin bərabər paya malik olması demək deyil. Məsələn, biz bir kitabı müqəddimə, əsas mətn və nəticə hissələrinə bölürüksə, bu o demək deyil ki, müqəddimə də əsas mətn qədər olmalıdır. Hədisdə işlənmiş "süls" (üçdə bir) sözünü məhz hərfi mənada qəbul etsək belə, bu, təxmini və nisbi bir bölgü kimi başa düşülməlidir. Yəni Qurani-kərim ümumi olaraq bu mövzuları ehtiva edir. "Bir hissəsi (yaxud üçdə biri) biz və düşmənlərimiz barədədir" sözünün də təhrifə əsla dəxli yoxdur. Burada "biz" deyəndə həm də bütün peyğəmbərlərin nəzərdə tutulması mümkündür. Və bilirik ki, bu haqda ayələr yetərincədir.

Xatırladaq ki, qeyri-şiə mənbələrində Peyğəmbərdən də bu növ hədislər nəql olunmuşdur. Belə ki, o həzrət buyurub: "Quranın dörddə biri yalnız biz Əhli-beyt haqda, dörddə biri düşmənlərimiz,

dörddə biri halal və haram, dörddə biri də fərz və hökmlər barədədir". (İbn əl-Məğazili Ə. "Mənaqib Əli", 394, h: 375)

### 1. 1. 7. Qiraət fərqləri

Əsassız olaraq, təhrif kimi qələmə verilən digər hədislər qiraət fərqlərinə aiddir. Nümunə olaraq, Kafidə qeyd olunmuş bir hədisə nəzər salaq: Əbu Bəsir deyir ki, mən İmam Sadiqə bu ayəni oxudum: "Bu, sizin əleyhinizə haqqı deyən kitabımızdır". (Casiyə/29) O dedi ki, kitab danışmaz, Allahın rəsulu kitabla (kitabda yazılanlardan) danışar. Bu ayə təhrif olunub və əslində, Allah-Taala belə buyurub: "Bu, sizin əleyhinizə həqiqət danışılan kitabımızdır". (Kuleyni, 8/50) Əvvəla, bu hədisin saxtalığı uzaqdan bəllidir. Bu ayələrdə söhbət Qurandan getmir ki, Allahın rəsulu onda yazılanlardan danışsın. Burada söhbət qiyamətdən və orada insana verilən əməl kitabından gedir. Lakin hədisin səhihliyini fərz etsək belə, Qurandakı qiraət fərqlərinə aiddir və təhrif dedikdə məhz bu nəzərdə tutulur. Çünki bu hədisdə "yəntiqu" sözünün "yuntəqu" kimi oxunması vacib sayılır ki, yalnız qiraətə - oxunuşa aid olduğu şübhə doğurmur.

Yaxud Osman əl-Xəmisin təhrif saydığı başqa bir hədisə baxaq: Rəvayətçi deyir ki, bir nəfər İmam Sadiqin yanında Quran oxuyurdu. Mən onun qiraətində camaatın oxuduqlarından fərqli hərflər eşidirdim. İmam ona dedi ki, bu qiraəti boşla, Qaim (İmam Mehdi) qiyam edənə qədər camaatın oxuduğu kimi oxu. O, qiyam edəndə isə Allah-Taalanın kitabını olduğu kimi oxuyacaq və Əlinin topladığı müshəfi aşkara çıxaracaq. (Kuleyni, 2/633) Rəvayətçinin "fərqli hərflər eşidirdim" ifadəsindən bəlli olur ki, həmin adam Quranı başqa ləhcədə oxuyurmuş. Qiraət elmindən xəbəri olanlar əsasən bədəvi ərəb qəbilələrinin Quranı müxtəlif ləhcələrdə oxumalarını bilirlər. Göründüyü kimi, burada imam onun qiraətini təsdiqləmir, hamı kimi oxumasını tapşırır, "Qaim qiyam edəndən sonra belə oxuyarsan" da demir. Sadəcə olaraq, bildirir ki, İmam Mehdi həzrət Əlinin topladığı, surələri nazilolma ardıcıllığı ilə tərtib olunmuş, bəzi təfsirləri və digər

açıqlamaları olan Quran kitabını aşkara çıxaracaq və onu ən düzgün qiraətlə oxuyacaq. Hədisin doğru olduğu təqdirdə, burada imamın ozamankı məşhur qiraəti tam düzgün saymadığı bəlli olur ki, bu da bir qiraət məsələsi olaraq, təhriflə bağlı deyil.

Qiraət fərqlərinə dair rəvayətlər qeyri-şiə mənbələrində də kifayət qədərdir. İbn Əbu Davudun 7 təriqlə nəql etdiyi rəvayətə görə, Xəlifə Ömər Ali-İmran surəsinin 2-ci ayəsinin "qəyyum" sözünü "qəyyam" kimi oxuyurmuş. (İbn Əbu Davud, 161-163) Başqa rəvayətlərə görə, Übəy ibn Kəb öz müshəfində Bəqərə surəsinin 226-cı ayəsinin "yulunə" sözünü "yuqsimunə", 158-ci ayəsinin "yəttəvvəfə" sözünü "yətufə" kimi yazıbmış. (Yenə orada, 165) Başqa bir rəvayətə görə, Xanım Aişə Muminun surəsinin 60-cı ayəsinin "yutunə mə ə`təu" hissəsinin Peyğəmbər tərəfindən "yətunə mə ətəu" şəklində oxunduğunu bildirib, sonradan təhrif edilərək mövcud şəklə salındığını deyirmiş. (Əhməd ibn Hənbəl. Əl-Müsnəd, 41/185, h: 24641) Lakin qeyd etdiyimiz kimi, bütün bunlar təhriflə deyil, qiraət fərqləri ilə bağlı nümunələrdir.

Qiraət fərqləri haqda danışarkən bir məsələni də qeyd etmək vacibdir: Texnikanın bu qədər inkişaf etdiyi bugünkü gündə də kitablarda hərf səhvləri görünürsə, təbii ki, onların ən ibtidai üsulla köçürüldüyü dövrlərdə daha çox və daha kobud səhvlər baş verə bilər. Bəzi hədislərdə qeyd olunan ayələrin yazılışındakı belə fərqlər zamanı bunu da nəzərə almaq lazımdır.

### 1. 1. 8. Nüsxə yanlışı

Təhrif iddiaçılarının əl-Kafiyə qarşı ən çox istinad etdikləri hədis "Quranın fəziləti" kitabının "Nadir hədislər" babının sonuncu – 28-ci hədisidir. Bu hədisdə İmam Sadiq buyurur: "Cəbrayılın Məhəmmədə (s) gətirdiyi Quran on yeddi min ayədən ibarətdir". (Kuleyni, 2/634) Halbuki əlimizdə olan Quranın ayələri bu rəqəmin üçdə birindən bir qədər artıqdır.

Bu hədis bizə Əhli-sünnə mənbələrində olan bir rəvayəti xatırladır. Xəlifə Ömərdən nəql olunan rəvayətdə onun Quranın bir milyon iyirmi yeddi min hərfdən ibarət olduğunu söylədiyi göstərilir. (Süyuti. Əl-İtqan, 1/242) Halbuki əlimizdəki Quranın bütün hərfləri bu rəqəmin təxminən üçdə biri qədərdir. Bu baxımdan, bəziləri bu iki rəvayəti eyni şəkildə həll etmək istəmişlər: əgər hər iki rəvayət səhih olsa, deməli, Xəlifə Ömər kimi İmam Sadiq də nəsx olunduğuna görə Quranda yazılmayan ayələri nəzərdə tutmuşdur.

Həqiqət isə başqadır. Əslində, İmam Sadiq bu hədisdə Quranın on yeddi min deyil, yeddi min ayədən ibarət olduğunu buyurmuş, "on" sözü isə rəvayətçi və ya nüsxə köçürənlərin səhvi ucbatından hədisə daxil edilmişdir. Buna dəlil Feyz Kaşaninin əl-Kafiyə şərh olaraq yazdığı əl-Vafi əsəridir. Feyz heç bir tərəddüd və şübhə etmədən uyğun hədisi "yeddi min" kimi qeyd və sonra şərh etmiş, (Feyz Kaşani M. Əl-Vafi, 9/1780-1781) təfsir kitabında da bunu bir daha vurğulamışdır. (Feyz Kaşani M. "Təfsir əs-safi", 1/54) Buna əsasən, onda olan əl-Kafi nüsxəsində hədisdə "on" sözünün olmadığı ortaya çıxır. Feyz Kaşaninin təhrif düşüncəsini çəkinmədən və açıq şəkildə Kuleyniyə aid etdiyini (Feyz Kaşani, "Təfsir əs-safi", 1/52) nəzərə alsaq, burada onun bilərəkdən hədisi dəyişdirmə ehtimalı da sıfra enir. Xatırladaq ki, Feyz Kaşani əl-Kafinin ən qədim şərhçilərindəndir və alimlər əl-Kafinin onda olan nüsxəsini daha etibarlı saymışlar. Əllamə Şərani bu barədə deyir: "Buradakı "on" sözü heç şübhəsiz, bəzi nüsxə köçürənlər və ya rəvayətçilər tərəfindən artırılmışdır". (Mazandarani, 11/76) Beləliklə, bu rəvayətə əsaslanan ittiham qapısı bağlanır və yaranmış şəkk həm sağlam məntiqə, həm də İslam hüququnun "Dər əl-hüdud bi əş-şübuhat" prinsipinə görə, müttəhimin xeyrinə işləyib, onu məsuliyyətdən azad edir.

Xatırladaq ki, məzhəbindən asılı olmayaraq, bəzi qədim əsərlərin mövcud nüsxələrində də belə səhvlər var.

Quranın yeddi min ayədən ibarət olmasına gəlincə isə, yuxarıda qeyd etdik ki, bu, tərtibatla bağlı məsələdir və həcmcə hər hansı dəyişiklik nəzərdə tutulmadığı üçün təhrif hesab olunmur.

Əl-Kafi kitabından Quranın azaldığına dəlil kimi göstərilən hədislər bunlardan ibarətdir və göründüyü kimi, onların biri də uyğun iddiaya əsas vermir. Bəhanəyə qalsa, çox sözdən bəhanə tapmaq olar, lakin İslam məntiqində belə bir şey yoxdur. İslama görə, dəqiq bilmədiyin bir iddianı edə, bilmədiyin məsələ ilə bağlı kimisə günahlandıra bilməzsən; üstəlik, bu məsələ çox ciddi və taleyüklü bir məsələdirsə. Çünki barəsində danışdığımız gözəl kitabımızda belə yazılıb: “(Ey insan!) Bilmədiyin bir şeyin ardınca getmə. Çünki qulaq, göz, ürək - bunların hamısı sorğu-sual olunacaqdır”. (İsra/36) Həmçinin oxuyuruq: “Onların buna dair heç bir elmləri (əminlikləri) yoxdur, yalnız zənnə qapılırlar. Zənn isə əsla həqiqəti çatdıra bilməz!” (Nəcm/28)

### 1. 2. Digər hədis kitabları

Bir daha vurğulamaq istəyirik ki, rəcm ayəsi kimi qeyri-şiə mənbələrindən keçmiş bir neçə hədisi çıxmaq şərtilə, Şiənin dörd əsas hədis kitabında, həmçinin Nəhcül-bəlağə və Səhifeyi-Səccadiyyədə Quranın təhrifinə - azaldılıb-artırılmasına dair hədis yoxdur. Lakin ikinci-üçüncü dərəcəli kitablarda və ya elmi çəkisi olmayan, əsas Şiə alimlərinin də əhəmiyyət vermədiyi bəzi əsərlərdə belə hədislərin olmasını istisna etmirik. Təbii ki, sayı bir neçə milyona çatmış İslam hədislərinin böyük əksəriyyəti elmi baxımdan etibarsızdır. Həm də bu yalnız Şiə rəvayətlərinə aid deyil. Unutmayaq ki, Buxari öz kitabında qeyd etdiyi təxminən 7 min yarım hədisi 600 min hədisin arasından seçib yazmışdır. Bu baxımdan, həm Şiə, həm Əhli-sünnə rəvayətləri arasında yüz minlərlə zəif və uydurma rəvayət olub və onların böyük qismi müxtəlif kitablarda hələ də qalmaqdadır.

Nəzərə almaq lazımdır ki, əl-Kafidə təhriflə bağlı olduğu iddia edilən 80-dən artıq hədisin heç birinin məsələyə dəxli yoxdursa, 2000

hədisin də çox böyük əksəriyyəti belə gülünc iftiralardan, yumşaq desək, yanlış iddialardandır. Hərçənd bunu anlamayan sələfilər hansı kitabda bu hədislərdən birini görürlərsə, o saat müəllifi təhrif düşüncəsində günahlandırır və təbii ki, ardınca lənətləyir və təkfir edirlər.

Hər halda, biz Şiə alimlərinin rəyi haqda danışarkən bu mövzuya bir də qayıdacağıq, lakin bütün kitablarda yazılmış təhrif hədislərini araşdırıb onların neçəsinin iddiaya uyğun olduğunu söyləmək çətindir. Hələliksə bildiririk ki, məhz təhrifə dəlalət edən və başqa bir açıqlaması olmayan azsaylı rəvayətlərin hamısı zəifdir, hədisləri az qala Qurandan da artıq müqəddəsləşdirən, əməldə isə həqiqətən ondan önə keçirən Əxbari alimlərinin uyğun rəyi Şiə məzhəbinə aid deyil. Həm də xatırladaq ki, sələfilərin mötəbər saydıqları mənbələrdə belə rəvayətlər dəfələrlə çoxluq təşkil edir. Lakin onlar öz gözlərində tiri görməyib başqasının gözündə çöp axtarır, vecsiz uşaqlar kimi ona-buna sataşmaqla ətrafdakıların diqqətini çəkməyə çalışırlar.

Yalnız təhrifə dəlalət edən rəvayətlərin zəif və uydurma olmasını hələ imamların dövründə yaşamış Fəzl ibn Şazanın (vəfatı: 260 h.) əl-İzah kitabı da təsdiqləyir. Təhrifə dair Əhli-sünnə hədislərinə kəskin etirazlarından (Bax: Fəzl ibn Şazan. Əl-İzah, 209-229) bilirik ki, belə Şiə rəvayətləri onun dövründə hələ uydurulmamış, yaxud ğalilərin saxta hədis toplularından kənara çıxmamışdı.

Burada bir mühüm məqam da var: Şiə mənbələrində gəlmiş azsaylı təhrif hədisləri arasında bütöv bir ayə və ya ayələrin Qurandan çıxarıldığını, yaxud ona əlavə olunduğunu göstərən rəvayət yoxdur. Qeyri-şiə mənbələrindən daxil olmuş bir neçə rəvayəti çıxmaq şərtilə bütün belə rəvayətlərdə ən pis halda hansısa ayənin söz və ya sözlərinin çıxarılmasından, yaxud dəyişdirilməsindən söhbət gedir. (Bax: Nəccarzadeqan F. Quranın təhrifdən qorunması haqda sual-cavablar, 25) Vilayət və Nureyn adlı qondarma surələrə gəlincə isə, ilk dəfə 17-ci əsrdə kimliyi, zərdüşt, yoxsa müsəlman sufi olması belə

bəlli olmayan hindistanlı müəllifin “Dəbestane məzaheb” kitabında gəlmiş, Nuri də heç bir əsası olmayan bu iddianı uğursuz əsərinə daxil etmişdir.

Digər tərəfdən, qeyri-şiə mənbələrinə aid təhrif hədislərində nəinki bütöv bir ayənin, bəzən hətta yüzlərlə ayənin Qurandan çıxarılmasından, bəzən isə bütöv surələrin əlavə edilməsindən söhbət gedir. Bir azdan bu haqda danışacağıq.

Yenə vurğulamaq istəyirik ki, əvvəlcə guya Əhli-beyti sevən bəzi Əxbari alimləri Şiə etiqadlarını Quranın təhrifi ilə bağlamağa cəhd etmiş, sonra isə vəhhabilər bunu böyüdərək Əhli-beyt məzhəbi əleyhinə dəlil-sübut kimi istifadə etməyə çalışmışlar. Həmin Əxbari alimlərindən biri Quranın təhrifinə dair bədnam kitabın müəllifi olan Mühəddis Hüseyn Nuri Təbrisidir.

### 1. 3. Mühəddis Nuri və onun kitabı

Şiənin Əxbari qolunun ifratçı nümayəndələrindən olmuş Hüseyn Nuri Təbrisi «Fəsl əl-xitab fi təhrif kitabi-Rəbb əl-ərbab» adlı kitab yazaraq Qurani-kərimin Peyğəmbərdən sonra təhrifə məruz qaldığını, onun bəzi hissələrinin çıxarıldığını iddia etmişdir. Biz müxtəlif məsələlər haqda danışarkən Nurinin fikirlərinə toxunacağıq. Lakin əl-Kafinin sözügedən hədisləri də daxil olmaqla, onun istinad etdiyi rəvayətlərin böyük əksəriyyətinin təhriflə əlaqəsi yoxdur, gətirdiyi bəzi əsassız dəlilləri görəndə isə Əllamə Şəraninin dediyi kimi, “adam bilmir ki, ona nə desin”.

Bəzi vəhhabilər bilmir, ya da bilərəkdən deyirlər ki, Nuri bədnam kitabını məhz Şiə hədislərinə istinadla yazmışdır. Ehsan İlahi Zəhir özünün “Şiə və Quran” kitabında Nurinin əsas dəlilləri olan Əhli-sünnə rəvayətlərini görməzdən gələrək yalnız Şiə rəvayətlərini qeyd etmişdir. Halbuki onun ayrı-ayrı fəsillərdə təqdim etdiyi 12 dəlilinin azı 6-7-i Əhli-sünnə rəvayətlərinə, yalnız 2-i Şiə rəvayətlərinə, qalanı isə müştərək rəvayətlərə əsaslanır. Bunu uyğun dəlillərə qısa nəzərdən də anlamaq olar:

Birinci dəlil: Keçmiş ümmətlərin Tövrat və İncil kitabları təhrif olunduğu üçün bu ümmətin Quran kitabının da təhrif olunmasının labüdlüyü;

İkinci dəlil: Quranın kitab halına salındığı zaman baş verənlərin normalda təhriflə nəticələnməsi;

Üçüncü dəlil: Oxunuşun (tilavətin) nəsxinin rəddi və bunun təhrif olması;

Dördüncü dəlil: İmam Əlidə mövcud Quranla fərqlənən Quran kitabının olması;

Beşinci dəlil: Abdullah ibn Məsudun mötəbər müshəfində mövcud Qurana nisbətən əlavələrin olması;

Altıncı dəlil: Übəy ibn Kəbin mötəbər müshəfində mövcud Qurana nisbətən əlavələrin olması;

Yeddinci dəlil: Osman ibn Əffan ikinci dəfə Quranı toplayanda bəzi söz və ayələri düşürməsi;

Səkkizinci dəlil: Qeyri-şiələrin rəvayətlərindən əlavə, Quranın azalmasına dəlalət edən Şiə rəvayətlərinin də çoxluğu;

Doqquzuncu dəlil: Keçmiş müqəddəs kitablarda vəsi və canişinlərin adlarının qeyd olunduğuna görə, onların Quranda da qeyd olunmasının vacibliyi;

Onuncu dəlil: Quranın hərf və sözlərinə dair qiraətçilərin fikir ayrılığı;

On birinci dəlil: Quranda ümumi şəkildə azalmaya dəlalət hədislərin çoxluğu;

On ikinci dəlil: Quranda konkret yerlərdə azalmaya dəlalət hədislərin çoxluğu və bəzi şübhələrə cavablar.

Bu baxımdan, iddia edə bilərik ki, Nuri şiə olsa da, onun Quranın təhrifinə dair əsaslandığı əksər dəlillər qeyri-şiə mənbələrində yer almış rəvayət və ya tarixi materiallardır. Onun bu əməlini Əllamə Əsgəri daha dəqiq xarakterizə etmişdir: "Şeyx Nuri ən etibarlı Əhli-sünnə kitablarına əsaslanmış və bu yarışmada Əhli-beyt məktəbinin Xəlifələr məktəbindən geri qalmamasını istəmişdir. Lakin

Əhli-beyt məktəbində oxşar dəlillər tapa bilmədiyinə görə sapqın ğalilərin rəvayətlərini, sənədsiz dualardan cümlələr, Xəlifələr məktəbindən keçmiş hədislər və müəllifləri tanınmayan kitablardan rəvayətlər toplayaraq Əhli-beyt məktəbinə aid etmişdir”. (Əsgəri M. “Əl-Quran əl-kərim və rivayat əl-mədrəsəteyn”, c. 3, fəsil: 1)

**1. 4. Quranın təhrifinə dair qeyri-şiə hədisləri**

Məlum olduğu kimi, Sələfilik İbn Teymiyyə (1263-1328), Vəhhabi sələfiliyi isə Məhəmməd ibn Əbdülvəhhabla (1703-1792) başlayan bir cərəyandır. Sələfilik əslində Əhli-sünnənin Əhli-hədis firqəsinin təhrif edilmiş forması olsa da, təməl fərqlərinə və hətta sünnilərə qarşı yönələn təkfirçi fikirlərinə görə müstəqil firqə hesab olunur. Lakin sələfilər mötəbər hədis toplusu kimi yalnız İmam Əhməd ibn Hənbəlin əl-Müsnəd və ya İmam Malikin əl-Müvəttə kitablarını deyil, həm də digər səhih və sünən əsərlərinə istinad etdiklərindən, biz də bu araşdırmada onların hamısına müraciət edəcəyik.

Əl-Kafinin hədislərini araşdırarkən belə mənbələrdə yer almış bəzi hədislərə işarə vurub, ayrıseçkilik etmədən onların da təhriflə bağlı olmadığını söylədik. Aşağıda qeyd edəcəyimiz rəvayətlər isə təhrifdən başqa yozumu olmayan qeyri-şiə rəvayətləridir. Bəzi Əhli-sünnə alimləri də bunu etiraf etsələr də, sələfilərdən fərqli olaraq, biz bu növ rəvayətlərin mövcudluğuna görə heç bir firqə və ya məzhəbi Quranın təhrif olunduğunu söyləməkdə ittiham etmirik. Lakin şiələri bunda ittiham edən vəhhabilər bu rəvayətlərin hər biri üçün cavab verməlidirlər. Çünki onlar vahid xəbəri – qeyri-mütəvatir hədisi etiqadda höccət sayırlar.

Xatırladaq ki, burada hədis və ya rəvayət dedikdə hədis toplularında qeyd olunmuş əsər, moquf və məqtuları – qeyri-məsum sözlərini də nəzərdə tuturuq.

Buxari və Əhmədin səhih bilərək qeyd etdiyi, Süyutinin Əbdürrəzzaq, Əhməd və İbn Hibbana istinadla yazdığı hədisə görə, Xəlifə Ömər həm rəcm (daşqalaq), həm də “atalarınızdan üz

çevirməniz küfrdür" ayəsinin Qurandan olduğunu və Peyğəmbərin vaxtında oxunduğunu bildirmişdir. (Buxari. Əs-Səhih, 8/168, h: 6830; Əhməd, 1/451, h: 391; Süyuti. "Əd-Durr əl-mənsur", 1/258) Rəcm "ayə"sinin Qurandan olduğunu Müslim, Tirmizi, Malik, İbn Macə və Əbu Davud da Ömərə istinadla qeyd etmişlər. (Müslim ibn Həccac. Əs-Səhih, 3/1317, h: 1691; Tirmizi M. Əs-Sünən, 3/90, h: 1432; Malik ibn Ənəs. Əl-Müvəttə, 5/1201, h: 3042; İbn Macə M. Əs-Sünən, 2/853, h: 2553; Əbu Davud S. Əs-Sünən, 4/144, h: 4418) Başqa bir rəvayətə görə, o, xilafəti zamanı rəcm (daşqalaq) ayəsinin Qurana düşmədiyinə görə təəssüf edərək deyirmiş ki, insanların tənəsindən qorxmasaydım, onu Qurana əlavə edərdim. (Buxari, 9/69, h: 7169; Malik, 5/1203, h: 3044; Əbu Davud, 4/144, h: 4418)

Göründüyü kimi, xəlifə bəlli cümlənin məhz ayə olduğunu deyir, Peyğəmbər dönəmində oxunduğunu bildirməklə, sonradan Qurandan çıxarıldığına təəssüflənməklə və onu Qurana daxil etmək istəməsi ilə oxunuşunun nəsx edilmədiyini – yəni Allahın əmrilə Qurandan çıxarılmadığını düşünürmüş. Sələfi İbn Kəsirin şagirdi olmuş görkəmli quranşünas Zərkəşinin (1344-1392) fikrincə, bu rəvayətdən sözügedən ayəni Qurana yazmağın öz-özlüyündə problemsiz olduğu başa düşülür. Çünki xəlifəyə mane olan amil xalqın tənəsi olmuşdur. (Zərkəşi, 2/36) Hədisin səhih olduğu təqdirdə, sələfilər iki haldan birini qəbul etməlidirlər: ya xəlifə haqlıdır və əlimizdəki Quran təhrif olunub, ya da haqlı deyil və o, bilmədən olsa belə, bu ayənin Qurandan çıxarıldığını düşünürmüş.

Bəzi mənbələrin məlumatına əsasən, "atalarınızdan üz çevirməniz küfrdür" ayəsinin yazıldığı xurma yarpağı Aişənin evində olub və onun qoyunu yarpağı yeyib. (İbn Əsir M. "Ən-Nihayə fi ğərib əl-hədis və əl-əsər", 2/87) Başqa bir rəvayətdə isə Aişə deyir ki, rəcm və böyük adama 10 dəfə süd vermək ayələrinin yazıldığı vərəq mənim evimdə yatağın altında idi. Peyğəmbər xəstələnəndə başımız ona qarışdı və bir heyvan (qoyun, keçi) evə girib onu yedi. (Əhməd, 43/342-343, h: 26316) Xəlifə Ömərdən nəql olunan və Quranın təhrif

olunduğuna dəlalət edən başqa bir rəvayətdə isə onun Quranın bir milyon iyirmi yeddi min hərfdən ibarət olduğunu söylədiyi göstərilir. (Süyuti C. Əl-İtqan, 1/242) Halbuki əlimizdəki Quranın bütün hərfləri bu rəqəmin təxminən üçdə biri qədərdir.

Müslimin rəvayətinə görə, Əbu Musa Əşəri (yəqin ki, Bəsrənin valisi olduğu zaman) bir gün şəhərin qiraətçilərini öz yanına çağırdı. O, 300 qiraətçinin toplaşmasından sonra söhbət edərək dedi: "Biz uzunluqda və məzmununun sərtliyində Bəraət surəsinə bənzər bir surə, həmçinin Müsəbbihat surələrindən birinə bənzər bir surə oxuyurduq". Əşəri daha sonra həmin iki surənin hər birindən xatırladığı kiçik bir hissəni əzbər oxudu. (Müslim, 2/726, h: 1050) Rəvayətdən aydın görünür ki, Əşəri qocaman səhabə kimi yeni qiraətçilərə bir zamanlar Quran kimi oxuduqları və mövcud Quranda yer almayan surələrdən danışır. Bu isə Peyğəmbərdən sonra Quranın təhrif olunduğunu göstərir. Xatırladaq ki, rəvayətdə nəsxdən söhbət getmir və belə bir iddia üçün mütləq dəlil olmalıdır.

Vəhhabilərin etimad etdiyi məşhur rəvayətçi və səhabələrdən olan Abdullah ibn Ömər deyir: "Kimsə bütün Quranı öyrəndiyini söyləməsin. Quranın çoxu əlimizdə deyil". (Süyuti C. Əl-İtqan, 3/81-82) Süyuti öz kitabında bu mövzuda çoxlu rəvayət nəql edir. Aişədən nəql olunan rəvayətdə deyilir ki, Əhzab surəsi Peyğəmbərin dövründə 200 ayə oxunurdu, Osman yazanda isə indikindən artığı tapılmadı. (Süyuti. Əl-İtqan, 3/82; Qurtubi, 14/113) Hüzeyfə deyir ki, bir gün Ömər ibn Xəttab məndən soruşdu: "Əhzab surəsi nə qədərdir?" Mən cavab verdim ki, 72, ya da 73 ayə. Ömər dedi: "O, Bəqərə surəsi kimi idi və onda rəcm ayəsi də vardı". (Süyuti. "Əd-Durr əl-mənsur", 6/559) Eyni fikir İkrimə (Yenə orada) və Übəy ibn Kəbdən (Əhməd, 35/134, h: 21206-21207) də nəql olunmuşdur. Onlar Əhzab surəsinin Peyğəmbərin dövründə Bəqərə surəsi qədər, ya da daha artıq olduğunu bildirmişlər. İbn Teymiyyənin şagirdi olmuş sələfi təfsirçi İbn Kəsir (1301-1373) bu hədisin Nəsainin qeyd etdiyi sənədini "həsən" – yaxşı kateqoriyasına aid etmişdir. (İbn Kəsir İ. Təfsir, 6/375)

Göründüyü kimi, vəhhabilərin ən mötəbər saydıqları mənbələrdə Əhzab surəsinin əslində Bəqərə surəsi qədər olduğuna dair çoxsaylı rəvayətlər mövcuddur. Bəzi Şiə ədəbiyyatında görünən oxşar rəvayətlər də qeyri-şiə təriqi ilə nəql olunan və qeyri-şiə mənbələrindən yol tapanlardır. Bununla belə, çox qəribədir ki, Məhəmməd ibn Əbdülvəhhab bunda da şiələri ittiham edərək yazır: "Onlar deyirlər ki, Əhzab surəsi Ənam surəsi qədər olub və Osman Əhli-beytin fəzilətlərinə dair hissələri çıxarıb". (Məhəmməd ibn Əbdülvəhhab. "Ər-Rədd əla ər-Rafizə", 1/14)

Uzun olduğu iddia olunan başqa bir surə də Bəraət surəsidir. Süyuti və Zərkəşinin yazdığına görə, Maliki məzhəbinin başçısı Malik ibn Ənəs deyirmiş ki, Bəraət surəsi Bəqərə surəsi kimi uzun idi və əvvəlində "Bismillah" da vardı. (Süyuti. Əl-İtqan, 1/226; Zərkəşi, 1/263) Hüzeyfə ibn Yəman isə deyirmiş ki, siz Bəraət surəsinin yalnız dörddə birini oxuyursunuz. (Hakim Nişaburi M. Əl-Müstədrək, 2/361)

Buxarinin nəql etdiyi, Sələfi hədisşünası Albaninin də səhih saydığı hədisdə İbn Abbasın Ali-İmran surəsinin 159-cu ayəsinə "bəzi" sözünü artıraraq qiraət etməsi göstərilir. (Buxari M. "Səhih əl-ədəb əl-müfrəd", 1/114, h: 115) Yaxud Ömər ibn Xəttab Həmd surəsinin 7-ci ayəsini "Siratə mən ənəmtə ələyhim ğayril-məğzubi ələyhim və ğayrizzallin" şəklində oxuyurmuş. (İbn Əbu Davud, 159-161) İkinci xəlifədən daha bir rəvayətə görə, onun müshəfində Müddəssir surəsinin 41-ci ayəsi yox imiş və o, "Cənnət bağlarında bir-birindən günahkarlar haqda soruşacaqlar. Sizi cəhənnəmə salan nə oldu?" (Müddəssir/40-42) ayələrini belə oxuyurmuş: "Cənnət bağlarında soruşacaqlar ki, ey filankəs, səni cəhənnəmə salan nə oldu?" (İbn Əbu Davud, 163)

Başqa bir rəvayətə görə, Übəy ibn Kəbin topladığı Quranda Həfd və Xəl adlı iki qısa surə də olub və hətta Ömər ibn Xəttab namazın qünutunda onları oxuyurmuş. Oxşar rəvayətlər digər səhabələrdən də nəql olunub. Hətta Ənəs onun Quran ayəsi olduğuna dair Allaha and içmişdir. (Süyuti. "Əd-Durr əl-mənsur", 8/695-697) Süyuti başqa bir

kitabında Übəy ibn Kəbin topladığı Quranda yer alan 116 surənin adlarını qeyd etmişdir. Süyutinin rəvayətinə görə, Abdullah ibn Məsud əlimizdəki Quranın son iki surəsini Qurandan hesab etməyərək onun 112 surədən ibarət olduğunu bildirirmiş. (Süyuti. Əl-İtqan, 1/226) Daha maraqlısı budur ki, Abdullah ibn Məsud son iki surəni öz Quranından silir və Qurandan olmadığına israr edirmiş. (Əhməd, 35/117, h: 21187) Bu hərəkətindən isə onun Quranı toplayan heyətin qərarı ilə razılaşmadığı ortaya çıxır. O, həm də etirazla deyirmiş: "Məni kimin qiraətinə tabe olmağa çağırırsınız?! Peyğəmbərin səhabələri bilirlər ki, mən onların arasında Allahın kitabına ən elmli şəxsəm". (Müslim, 4/1912, h: 2462) Xatırladaq ki, Quranı toplayan heyətin başçısı gənc səhabələrdən olmuş Zeyd ibn Sabit idi. Abdullah həmçinin deyirdi ki, mən Peyğəmbərin ağzından 70 surə öyrənəndə Zeyd ibn Sabit uşaqlarla oynayırdı. (İbn Əbu Davud, 74)

Ən qəribəsi odur ki, səhih kitablarının rəvayətinə görə, Peyğəmbər Abdullah ibn Məsud və Übəy ibn Kəbi ən yaxşı dörd qiraətçidən ikisi kimi təqdim etmiş və Quranı onlardan öyrənməyi tapşırmışdı. (Buxari. Əs-Səhih, 5/28, 6/186, h: 3760, 4999; Müslim, 4/1913-1914, h: 2464) Halbuki onların biri mövcud Qurana iki surə artırır, biri isə ondan iki surə çıxarır. Yəni mövcud Quran Peyğəmbərimizin təkidlə təqdim etdiyi iki Quran müəlliminin heç biri tərəfindən təsdiqlənməmişdir; təbii ki, sələfilərin mötəbər hədis kitablarına əsasən.

Quran təhrifinə dair başqa bir məsələ "Bismillahir-Rəhmanir-Rəhim" ayəsi ilə bağlıdır. Şiələr bugünkü Quranda Tövbə surəsindən başqa bütün surələrin əvvəlində mövcud olan bu ayələri Qurandan sayır və hər surənin əvvəlində Allah tərəfindən nazil olduğunu söyləyirlər. Buna ilk dəlil mövcud Quranda uyğun şəkildə yerləşdirilməsidir. Belə ki, ayə olmadığı təqdirdə surələrin əvvəlinə artırılması təhrif olardı. Lakin hamının qəbul etdiyi kimi, Quran təhrif olunmayıb və olunmayacaq. Bu baxımdan, sələfilərin Quranın 113

ayəsini onun tərkib hissəsi deyil, əlavə hesab etmələri, eyni zamanda digərlərini təhrif düşüncəsində günahlandırması əsla başadüşülən deyil. Bunu qiraət fərqləri ilə izah edənlərə isə xatırlatmaq istəyirik ki, burada söhbət hansısa ayə və ya sözlərin fərqli oxunuşundan deyil, 113 ayənin tamamən Qurandan çıxarılmasından gedir.

Bu başlığı Misirin əl-Əzhər universitetinin şəriət fakültəsinin dekanı və görkəmli əhli-sünnə mütəfəkkirlərindən olmuş Məhəmməd Məhəmməd əl-Mədəninin (1907-1968) sözü ilə bitirmək istəyirik: "Deyirlər ki, şiələr Quranın azaldığını düşünürlər. Allaha sığınırıq! Əslində, bizim kitablarımızda olduğu kimi, onların kitablarında da belə rəvayətlər var və hər iki firqənin tədqiqatçıları onları zəif saymış, rədd etmişlər. Nə İmamiyyə, nə Zeydiyyə şiələri, nə də Əhli-sünnə mənsubları belə bir etiqada malikdirlər. Kim istəyirsə, Əhli-sünnə məzhəbindən olan Süyutinin əl-İtqan kitabına baxıb çoxlu səhifələri tutmuş belə rəvayətləri görə bilər". (Mədəni M. "Rəccə əl-bəs", 382)

### 1. 5. "Abdullah ibn Məsud" problemi

Qeyri-şiə hədisşünaslar qədimdən Abdullah ibn Məsudun bu əməlinin Quranın təhrifini qəbul etmək demək olmadığını isbatlamaq üçün cox cəhdlər etmişlər. Baqillani iddia edirdi ki, zəif və ya ən azı vahid hədislərlə onun belə bir etiqada malik olduğunu söyləmək olmaz. Səhabəni uyğun ittihamdan uzaqlaşdırmaq üçün onlarla dəlil və ehtimal irəli sürən Baqillaniyə görə, bu rəvayətlərin səhih olduğunu qəbul etsək belə, deməliyik ki, İbn Məsud son iki surənin Quran və vəhy olmasına deyil, Quranda yazılmasına etiraz etmişdir. (Baqillani M. Əl-İntisar, 1/318) Lakin Səhih-Buxarini şərh etmiş ən güclü hədisşünaslardan olan İbn Həcər Əsqəlani deyir: "Bu, yaxşı yozumdur, lakin qeyd etdiyim səhih və səlis hədis bunu açıq-aşkar rədd edir. Belə ki, hədisdə onun "bu iki surə Allahın kitabından deyildir" söylədiyi qeyd olunur". (İbn Həcər Ə. "Fəth əl-bari", 8/743)

Quranın son iki surəsinə dair bu hədislər qeyri-şiə alimləri arasında əməlli-başlı problemə çevrilmişdir. İbn Həcər bu barədə

Nəvəvinin, İbn Həzmin və Fəxr Razinin də görüşlərini qeyd edərək onların hər üçünün Abdullah ibn Məsuda dair bu iddiaları yalan hesab etdiyini yazır. Lakin təbii ki, İbn Həcər kimi bir hədis alimi Səhih adlandırdığı kitabda yer almış hədislərin yalan olmasını qəbul etmir. O, Fəxr Razinin fikrini bu şəkildə qeyd edir: "Əgər bu iki surənin İbn Məsudun dövründə mütəvatir şəkildə Qurandan sayıldığını desək, onları inkar edəni kafir bilməliyik; əgər qeyri-mütəvatir şəkildə Qurandan sayıldığını desək, Quranın bəzi hissələrinin qeyri-mütəvatir olduğunu qəbul etməliyik. Bu, bərk düyündür". İbn Həcər sonra yazır ki, bu iki surənin İbn Məsudun dövründə mütəvatir şəkildə Qurandan sayıldığını, lakin İbn Məsudun fikrincə, mütəvatir olmadığını ehtimal etsək, düyün açılmış olar. (Yenə orada) İbn Teymiyyə də problemi bu şəkildə həll etməyə çalışmışdır. (İbn Teymiyyə Ə. "Məcmu əl-fətava", 12/493)

Lakin bu həllin əsassızlığı da aydın görünür. Necə ola bilər ki, son iki surə bütün böyük səhabələr tərəfindən Qurandan sayılsın, amma İbn Məsud onların bu fikrindən xəbərsiz olsun və nəticədə həmin surələrin mütəvatir şəkildə Quranın tərkib hissəsi sayılmasını bilməsin?! Hədis və tarix qaynaqları sübut edir ki, vahid Quran kitabı ətrafında kifayət qədər ciddi dartışmalar getmiş və İbn Məsud da bu polemikaların içində olmuşdur. Onun səhabələrin uyğun icmasından xəbərsiz olduğunu düşünmək absurddur. Əslində, bəzi müsəlman alimlərinin bütün bu cəhdləri göstərir ki, sözügedən hədislərdəki iddianı qəbul etmək Quranın təhrif olunduğuna gətirib çıxarır.

Biz İbn Məsudun uyğun mütəvatirlikdən və hətta icmadan xəbərsiz olduğuna inanmasaq da, onun xəyanət deyil, səhv etdiyini qəbul edirik. Məşhur Əhli-sünnə alimi İbn Həcər Əsqəlaniyə, Sələfizmin banisi İbn Teymiyyəyə və bugünkü bəzi vəhhabilərə görə, Abdullah ibn Məsud həqiqətən bu səhvə yol verib, lakin bu onun ictihadıdır və küfrünə səbəb olmur. Əslində, çox tolerant və mütərəqqi yanaşmadır, İslamın sülh, sevgi və şəfqət ruhuna tam uyğundur. Lakin nə üçün onlar bu qaydanı ancaq özlərinə sərf edəndə tətbiq

edirlər? Nə üçün müqəddəs saydıqları səhabəni təmizə çıxarmaq üçün bu qaydaya üz tutur, amma Şiənin hansısa qoluna mənsub olan hansısa alim belə bir söz deyəndə nəinki ictihad etdiyini söyləmir, hətta belələrinin sözünü bütün Əhli-beyt davamçılarına aid edib hamısını kafir sayırlar, təkfir təkfir dalınca gəlir? Halbuki Şiə alimlərinin çox böyük əksəriyyəti belə hədisləri ya təhriflə əlaqələndirmir, ya da kökündən zəif sayaraq qəbul etmirlər. Təəssüf doğuran heç bir məntiqə sığmayan bu ikili standartdır.

**1. 6. Təhrif mövzusunda Nəsx anlayışı**

Yuxarıdakı nümunələrin Quranın təhrifinə dəlalət edən qeyri-şiə hədislərinin yalnız bir hissəsi olduğunu iddia etsək, yanılmarıq. Biz yalnız əsas hədis kitablarından və Qurana dair bəzi əsərlərdən yalnız bəzi nümunələri qeyd etməyə çalışdıq. Biz də Ehsan Zəhir kimi rəvayətlərin sayını artırmaq istəsəydik, heç şübhəsiz, minlərlə hədis toplaya bilərdik. Sələfi təfsirçi Alusinin dediyi kimi, "bu barədə hədislərin sayı-hesabı yoxdur". (Alusi M. "Ruh əl-məani", 1/26) Lakin biz kəmiyyətin hər hansı əhəmiyyət daşıdığını düşünmürük. Bizcə, Şiə və ya Əhli-sünnə mənbələrində yer almış təhrif hədisləri ya mənanın, ya surələrin düzülüşünün dəyişdirilməsinə, ya əlavə təfsirlərin çıxarılmasına, ya qiraət fərqlərinə aiddir, ya uydurmadır, ya da uzaqbaşı hansısa səhabənin səhvi və yanlış ictihadı. İndi isə görək hər bir fürsətdə Şiə alimlərini aşağılayan sələfilərin özləri bu barədə nə deyirlər.

Sələfilər yuxarıda qeyd olunan və olunmayan hədislərin təhriflə bağlı olmadığını, sözügedən cümlələrin əslində əvvəlcə Quranda yer aldığını, sonra isə oxunuşlarının nəsx edilərək Qurandan çıxarıldığını bildirirlər. Nəsx Quran ayəsinin qüvvədən düşməsidir. Bəzi ayələr başqa ayələrin gəlişi ilə nəsx olmuş, hökmləri qüvvədən düşmüşdür. Bu zaman birinci ayəyə mənsux (nəsx olunan), ikinci ayəyə isə nasix (nəsx edən) deyilir. Quran-kərimdə bu haqda buyurulur: "Biz hər hansı bir ayəni (yaxud: ilahi əlaməti) nəsx edir (qüvvədən salır) və ya

unutdururuqsa (yaxud: təxirə salırıqsa), ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk”. (Bəqərə/106)

Müsəlmanların icmasına görə, Quranın bəzi ayələri nəsx olmuş, yəni hökmləri qüvvədən düşmüş və yeni hökmləri ehtiva edən yeni ayələr gəlmişdir. Lakin bununla belə, mənsux – yəni hökmü qüvvədən düşmüş ayələr Qurandan çıxarılmamış, öz yerində qalmışdır. Nümunə üçün deyək ki, Mücadilə surəsinin 13-cü ayəsi 12-ci ayəni nəsx edərək hökmünü qüvvədən salmış, eyni zamanda nəsx olmuş ayə Qurandan çıxarılmamışdır.

Mahiyyətindən göründüyü kimi, nəsx bəzi müstəsna yerlərə aiddir və onun çoxluğu müqəddəs kitabın etibarına xələl gətirə bilər. Bir tərəfdən, tez-tez hökmünü dəyişmək Allahın məqam və hikmətinə uyğun deyil, digər tərəfdən, belə bir kitab ziddiyyətlə dolmuş, ayələri bir-birini inkar etmiş olar. Məşhur Əhli-sünnə alimi Zərkəşinin yazdığına görə, Quranın 6 surəsində nasix, 40 surəsində mənsux, 31 surəsində isə həm nasix, həm mənsux ayə vardır, Maidə surəsinin 105-ci ayəsinin isə sonu əvvəlini nəsx etmişdir. (Zərkəşi, 2/33-35) Bəzən isə fərqli şəraitə aid olan “Sizin dininiz özünüzə, mənim dinim özümə” (Kafirun/6) ayəsinin “Müşrikləri öldürün” (Tövbə/5) ayəsi ilə nəsx olunduğunu bildirmişlər. (Zərkəşi, 2/31) Halbuki nəsxin iddia olunduğu ayələrin bəzisi ümumi şəkildə gəlmiş ayələrdən istisnalar, bəzisi ümumi və mütləq aələrin təfsilatı, bəzisi fərqli şəraitlərə xas hökmlərdir.

Əksər Əhli-sünnə və Sələfi alimləri nəsxin 3 növdən ibarət olduğunu iddia etməklə onların sayını qat-qat artırmışlar: 1. Həm hökmün, həm oxunuşun nəsx olunması; 2. Oxunuşun qalıb, hökmün nəsx olunması; 3. Hökmün qalıb oxunuşun nəsx olunması. Əksər Şiə və bəzi Əhli-sünnə alimləri isə nəsxin yalnız 2-ci qismini qəbul edir və nazil olmuş ayənin heç bir halda Qurandan (oxunuşdan) çıxarılmadığını bildirirlər.

Bu kiçik yazıda geniş araşdırma imkanımız olmasa da, qeyd etməliyik ki, oxunuşun nəsx olunduğuna, başqa sözlə desək, hər hansı

ayənin Peyğəmbər tərəfindən Qurandan çıxarıldığına yetərli dəlil yoxdur. Buna yeganə səbəb isə Quranın təhrifinə dəlalət edən və yuxarıda qeyd etdiyimiz qeyri-şiə rəvayətləridir.

Hökm qala-qala oxunuşun nəsxi iddiasında olanlar bəzən müsəlmanların imtahana çəkilməsini bunun səbəbi kimi göstərmişlər. Guya bununla ümmətin itaətkarlıq dərəcəsi bilinmiş olur: əsl möminlər yuxu ilə övladını qurban kəsməyə qalxan İbrahim kimi müti olub, əminliyə çatmadan zənn əsasında Allahın hökmünə əməl etsinlər. (Zərkəşi, 2/37) Halbuki əvvəla, İbrahim boynuna düşənə tam əmin idi və buna zərrəcə şübhəsi yox idi. İkincisi, zənn əsasında hərəkət etməyi dəfələrlə yasaq edən (Ənam/116, 148; Yunus/36, 66; Hucurat/12; Nəcm/23, 28) Allahın eyni zamanda zənn olunan hökmlərin yerinə yetirilməsini, zənnə əsaslanaraq günahkar insanların daşqalaq edilməsini gözləməsi nə dərəcədə məntiqə uyğundur?!

Süyuti isə hökm qala-qala oxunuşun nəsxinin fəlsəfəsini belə açıqlayır: "Bununla bağlı ağlıma gözəl bir fikir gəldi: Bunun səbəbi ümmətə güzəştdir. Yəni hökmü qalsa da, Quranda yazılışı və oxunuşu məşhur olmasın, çünki bu (daşqalaq hökmü) ən ağır və sərt hökm, ən şiddətli cəzadır. Bu nəsxdə (hökmü) gizlətməyin müstəhəb olmasına işarə vardır". (Süyuti. Əl-İtqan, 3/86-87)

Göründüyü kimi, sələfilərin bəzi sələfləri nə bu hədislərin zəifliyini söyləyə bilirlər, nə də sözügedən səhabələrin səhvə yol vermələrini. Onlar çıxış yolu kimi yalnız oxunuşun nəsxi amilindən istifadə etməyə çalışır və buna özlərindən müxtəlif səbəblər də göstərirlər. Bunun nə qədər "uğurlu" olduğu isə göz önündədir.

Necə qəbul etmək olar ki, Allah-Taala bir ayəni nazil etsin, həmin ayə Quranın tərkib hissəsi kimi oxunsun, sonra isə buyursun ki, bu ayənin hökmünə əməl edin, amma onu Qurandan çıxarın. Maraqlıdır, hökmə dəlalət edən mətni – ayə və ya hədisi yox etdikdən sonra hökm nəyə əsaslana bilər?! Hikmət sahibi olan Allah haqda belə bir söz söyləmək olarmı?! Yuxarıda Xəlifə Ömərin Quranın bir milyon iyirmi yeddi min hərfdən ibarət olduğunu söylədiyinə göstərən hədisi

qeyd etdik. Bu rəvayəti Təbərani kitabında gətirmiş, Süyuti də rəvayətçilərinin siqə - etimadlı şəxslər olduğunu yazmışdır. Lakin çox qəribədir ki, Süyuti onu da oxunuşun nəsxi ilə əlaqələndirmişdir. (Yenə orada, 1/242-243) Yəni Quranın üçdə ikisi nəsx yolu ilə çıxarılmış və yalnız üçdə biri qalmışdır!

Əslində isə, əvvəla, bu cümlələrin Quran ayəsi olduğuna dair vahid hədislərin özlərindən başqa dəlil yoxdur. İkincisi, onlar həqiqətən ayə olmuşdursa, oxunuşları nə vaxt nəsx olunmuşdur? Əgər Peyğəmbərin dövründə nəsx olunmuş və Peyğəmbərin göstərişi ilə Qurandan çıxarılmışdırsa, bunu isbat etmək lazımdır; əgər rəvayətlərin zahirindən də göründüyü kimi, Peyğəmbərdən sonra Qurandan çıxarılmışdırsa, bu, təhrifdən başqa bir şey deyil.

"Oxunuşun nəsxi" nəzəriyyəsi Quran sözünü, əsassız olaraq, vahid xəbərlə isbatlama cəhdi olsa da, məsələ burasındadır ki, yuxarıda qeyd etdiyimiz nümunələrin əksərində nəsxə dəlalət edən vahid hədis belə yoxdur. Bəzi rəvayətlərdə müəyyən ayələrin Quranda yer almaması açıq şəkildə nəsxlə əlaqələndirilmiş, vahid hədis həddində olsa da, nəsxə dəlalət edən bir söz deyilmişdir. Məsələn, Ənəsin rəvayətinə görə, "Bir məunə" hadisəsində şəhid olanlar barədə Quran ayələri nazil olmuşdu, sonra isə nəsx oldu. (Buxari. Əs-Səhih, 4/21, h: 2814; Müslim, 1/468, h: 677) Lakin vəziyyət o qədər ifrat həddə çatıb ki, nəinki mütəvatir və nəinki vahid hədis olmadan, hətta hədisin özündə nəsxə qarşı işarə ola-ola yenə də uyğun rəvayətlərin məzmununu oxunuşun nəsxinə aid etməkdədirlər. Bu isə çox primitiv və olduqca qeyri-elmi yanaşmadır. Yuxarıda Abdullah ibn Məsudla bağlı ən böyük alimlərin rəyində də gördük ki, onlar bu yolu tutmayıblar və ümumuiyyətlə, bu, mümkün də deyil.

Yaxud rəcm ayəsinə nəzər salaq. İbn Teymiyyə deyir ki, bu ayənin hökmü qalıb, tilavəti nəsx olub. (İbn Teymiyyə. "Məcmu əl-fətava", 20/398-399) Halbuki qeyd olunan hədislərdə nəinki buna heç bir işarə yoxdur, üstəlik, ikinci xəlifə bu ayənin Peyğəmbərin dövründə həm oxunduğunu, həm də ona əməl olunduğunu bildirir. O

deyir ki, xalqın tənəsindən qorxmasaydım, ayəni Qurana əlavə edərdim. (Buxari. Əs-Səhih, 9/69, h: 7169; Malik, 5/1203, h: 3044; Əbu Davud, 4/144, h: 4418) Süyutinin yazdığına görə, Quran toplanan vaxt Ömər bu ayənin də Qurandan olduğunu bildirərək kitaba salınmasını təklif etmiş, lakin ikinci şahid tapmadığına görə təklifi nəzərə alınmamışdı. (Süyuti. Əl-İtqan, 1/206)

Göründüyü kimi, nə bu hədislərdə, nə də uyğun tarixi hadisələr zamanı kiminsə rəcm ayəsinin Quranda olub nəsx edildiyini söyləməsi qeyd olunmamışdır. Xəlifə Ömərin onu Qurana əlavə etmək istəməsi də sübut edir ki, ortada nəsx söhbəti yox imiş. Burada iddia olunan nəsx isə həm bu hədisləri, həm də xəlifəni ittihamlardan qorumağa hesablanmış dəlilsiz iddiadır. Mümkün deyil ki, ayə nəsx olsun, mütəvatir həddində çoxlu səhabələr bunu bilsinlər, amma Peyğəmbərin yerində oturmuş bir xəlifə üstündən 15 il keçəndən sonra da bunu bilməsin. Bu da inandırıcı görünmür ki, ayə nəsx olsun, Allahın əmrilə Qurandan çıxarılsın, amma xəlifə onu Qurana yazmaq istəsin, Allahdan qorxduğuna görə deyil, yalnız xalqın qınağını nəzərə alıb, bu işdən vaz keçsin. Əslində isə, sələfilər ya belə rəvayətləri yanlış sayıb kənara qoymalı, ya da dildə məsum saymadıqları xəlifənin və digər belə səhabələrin bəzi sözləri səhvən Quran ayəsi ilə qarışdırdıqlarını qəbul etməlidirlər. Heç bir əsas olmadan bu rəvayətləri "oxunuşun nəsxi" qrupuna aid etmək isə Allahın kitabına müdaxilədən başqa bir şey deyil.

Aişədən nəql olunan hədisdə deyilir: "On dəfə məlum əmizdirmə ilə məhrəm olurlar" ayəsi Quranda var idi. Sonra isə beş dəfə əmizdirmə ayəsi ilə nəsx oldu. Lakin bu ayə Peyğəmbər vəfat edəndə də Quranın tərkib hissəsi kimi oxunurdu". (Müslim, 2/1075, h: 1452; Nəsai Ə. Əs-Sünən, 6/100, h: 3307; Malik, 4/877, h: 2253) Bəli, nəsxin iddia olunduğu digər ayələrdən fərqli olaraq, burada birinci ayənin nəsx olunduğu açıqca bildirilir. Lakin bu da açıq göstərilir ki, ayənin nəsx olunması Qurandan silinməsi demək deyil və o, nəsx olunmasına baxmayaraq, Peyğəmbərin ömrünün sonuna qədər Quran

ayəsi kimi oxunurdu. Bu hədisin səhihliyini İbn Teymiyyə də təsdiqləmişdir. (İbn Teymiyyə. "Məcmu əl-fətava", 34/41, 59). Ancaq maraqlıdır ki, əlimizdəki Quranda nəinki mənsux (nəsx olunmuş), heç nasix (nəsxedən) ayə də yoxdur. Nəsx olduqdan sonra və Peyğəmbərin ömrünün sonuna qədər oxunan bir ayəni Allahın hökmü və Peyğəmbərin icazəsi olmadan Qurandan çıxarmaq təhrif deyilsə, bəs nədir?! Xatırladaq ki, bəzi Əhli-sünnə alimləri rəvayətin "bu ayə Peyğəmbər vəfat edəndə Quranın tərkib hissəsi kimi oxunurdu" hissəsinə diqqət çəkib onu "ciddi irad" hesab etmişlər. (Nəhhas Ə. "Ən-Nasix və əl-mənsux", 64) Odur ki, ya bu rəvayət rədd edilməli, ya da möminlər anasının səhvə yol verdiyi söylənməlidir. Üçüncü variant Quranın həqiqətən təhrif olunmasıdır ki, qəti əqli və nəqli dəlillərə görə imkansızdır.

Biz yuxarıda Übəy ibn Kəbin "Peyğəmbərin dövründə Əhzab surəsi Bəqərə surəsi qədər, ya da daha artıq idi və onda rəcm ayəsi də vardı" fikrini qeyd etdik. Sələfilərin sevimli təfsirçisi İbn Kəsir bu hədisin Nəsainin qeyd etdiyi sənədini "həsən" – yaxşı kateqoriyasına aid edərək yazır: "Bu hədisə görə, o zaman Quran ayələri olmuş, sonra isə həm mətni, həm də hökmü nəsx olunmuşdur". (İbn Kəsir, 6/375.) Təsəvvür edin, bir surənin dörddə üçü - 213 ayəsi nəsx olub, amma əvvəla, rəcm ayəsindən başqa bir ayədən xəbəri olan yoxdur; ikincisi, bir surədə bu qədər ayənin nəsx olunduğuna dəlil yoxdur; üçüncüsü, bu ayələri Qurana yerləşdirməkdə Hikmətli Allahın məqsədi qaranlıq qalır. Onları əvvəldən Quran kimi deyil, başqa bir formada Peyğəmbərə çatdıra bilməzdimi? Bu qədər ayənin nəsx olmasının özü Quran haqda ziddiyyətli fikirlər yaradıb, onun təhrifinə səbəb olmazmı? Dördüncüsü, onlar hansı ayə və hökmlərlə nəsx olunmuş, əvəzlənmişlər? Çünki nəsx ayəsinə əsasən, nasix ayə gəlmədən heç bir ayə nəsx edilə bilməz. Beşincisi, bir "həsən" hədislə Allahın nazil etdiyi kitaba 213 ayə səviyyəsində müdaxilə etmək hansı elmi normalara sığır?! Və altıncısı, bu hədisin harasında onların oxunuşunun nəsx edildiyi göstərilir?! Əslində, bu hədislə Quran

arasında ziddiyyət var və ziddiyyətin həlli üçün əsassız kəşflər düşünmək yox, ya güclü arqumenti olan çıxış yolu tapmaq, ya da hədisi divara çırpmaq lazımdır.

Doğrudur, nəsx Allah tərəfindən, təhrif isə bəşər tərəfindən olur. Amma ürəyimiz istəyən yerdə hansısa ayənin nəsx olunduğunu deyə bilərikmi?! Bəs buna dəlil lazım deyil?! Axı adını nəsx qoyanda problem həll olmur. Hansısa ayənin nəsx olunduğunu mütləq sübut etmək lazımdır. Çıxılmaz vəziyyətdə qaldıqda "nəsx olub" demək isə heç bir məntiqə sığmır. Hər hansı ayə Qurandan çıxarılmalı idisə, Peyğəmbərin özü tərəfindən çıxarılmalı idi. Bu rəvayətlərdə isə onların Peyğəmbərin sağlığında oxunduğu bildirilir.

Oxunuşun nəsx olunması fikri digər mənbələrdən bəzi Şiə mənbələrinə də keçmiş görünür. Əslində isə, Seyid Mürtəza (Mürtəza. Əz-Zəriə, 1/428), Şeyx Tusi (Tusi M. "Ət-Tibyan fi təfsir əl-Quran", 1/13) və Fəzl Təbrisi (Təbrisi F. "Məcmə əl-bəyan", 1/338) kimi alimlər bunu nəzəri cəhətdən mümkün saysalar da, həyata keçdiyinə dair əsaslı nümunə tapmamışlar. Mürtəza isə açıq-aşkar bildirir: "Hökm qala-qala oxunuşun nəsx olunmasına (ayənin Qurandan çıxarılmasına) dair misal dəqiq deyil, vahid hədislərdəndir. O da budur ki, (rəcm ayəsi) Qurandan olmuş, sonradan oxunuşu nəsx edilmişdir. Həm hökmün, həm də oxunuşun nəsxinə dair misal - Aişədən nəql olunan on dəfə əmizdirmə hədisi - də vahid hədisdir". (Mürtəza. Əz-Zəriə, 1/429)

Qarşılığında, bu növ nəsxi Əhli-sünnə alimlərindən də qəbul etməyib məsələni uyğun rəvayətlərin rəddi ilə həll edənlər var. Qazi Əbu Bəkr Baqillaniyə görə, bəzi alimlər bu nəsxi qəbul etməyib, Quran ayələrinin vahid hədislərlə nəsxinin imkansız olduğunu bildirirlər. (Zərkəşi, 2/39-40) Əbu Cəfər Nəhhas (vəfatı: 949) isə rəcm ayəsi barədə rəvayətin səhih olduğunu bildirməklə yanaşı, hökmünün Quran hökmünə çatmadığını və bəlli cümlənin ayə deyil, Peyğəmbər sözü olduğunu yazmışdır. (Nəhhas, 61) Sübhi Saleh (1926-1986) həm hökmlə birgə, həm də hökm qala-qala oxunuşun nəsx olunması fikrini

“qəribə cəsarət”, belə düşüncəyə sahib olanları isə “nəsx aşiqləri” adlandırıb kəskin surətdə tənqid edir və İbn Zəfərin (1104-1172) Yənbu kitabından belə bir sitat gətirir: “Vahid hədis (hansısa sözün) Quran ayəsi olduğunu isbat edə bilməz”. (Sübhi Saleh İ. “Məbahis fi ülum əl-Quran”, 265-266) Oxunuşun nəsxi nəzəriyyəsinə irad bildirən Əhli-sünnə alimlərinə misal olaraq, Şovkani, Rəşid Rza, Rafei və digərlərinin, eləcə də Mustafa Zeydin “ən-Nəsx fi əl-Quran əl-kərim”, Əli Həsənin “Fəth əl-mənnan fi nəsx əl-Quran”, Məhəmməd İsmayıl Şəbanın “Nəzəriyyə ən-nəsx”, Cavad Musanın “ər-Rəy əs-səvab fi ən-nasix və əl-mənsux” kitablarının adlarını çəkmək olar.

Bütün deyilənlərə əsasən, çoxlu ayələrin oxunuşunun nəsx olunduğuna dair iddia heç bir dəlilə əsaslanmayan fərziyyədir və əsrlər ötməsinə baxmayaraq, sübut olunmamış fərziyyə kimi də qalmaqdadır. Hədisləri Quranla ölçməli olduğumuz halda uzaqbaşı güman və zənn yaradan vahid hədislərlə Qurana müdaxilə etmək, hansısa cümlələrin Quran vəhyi olduğunu söyləmək, həqiqətən, təhlükəli bir hal və müqəddəs kitabımıza qarşı hörmətsizlikdir. Biz bu iddianı rədd etməklə kiminsə küfrünü isbatlamaq fikrində də deyilik. Allaha şükür olsun ki, bizdə təkfirçilik xəstəliyi yoxdur və bunu nəinki küfrə, heç xəyanətə də səbəb bilmir, ən pis halda səhv və xəta hesab edirik. Mənsux ayə olduğu iddia edilən cümlələrdə heç bir ambisiya ehtimalının olmaması da bunun yalnız səhv olduğunu təsdiqləyir.

Sözügedən cümlələrin Allah kəlamı və Quran vəhyi olmamasına başqa bir dəlil də onların mətninin zəifliyidir. Quranın ədəbi-bədii incəliklərinə vaqif olan heç kim çox bəsit, uyğunsuz, bəzən isə hətta qrammatik səhvi olan bu cümlələrin Allah kəlamı olmadığına şübhə etməz. (Ətraflı məlumat üçün bax: Bəlaği M. “Ala ər-Rəhman fi təfsir əl-Quran”, 1/20-24) Əslində, Qurani-kərimin nəsx olmuş azsaylı ayələri kitabdan çıxarılmamışdır və əlimizdəki Quranda mövcuddur. Bunu tarixi faktlardan əlavə, bəzi hədislər, o cümlədən Buxarinin qeyd etdiyi bir hədis də sübut edir. İbn Zübeyr Osmandan Bəqərə surəsinin 234-cü ayəsi haqda soruşur ki, nəsx olunmuş bu ayəni nə üçün Qurana

yerləşdirmisən? Osman isə belə cavab verir: "Ey qardaşım oğlu! Mən Quranın heç bir hissəsini yerindən tərpədə bilmərəm". (Buxari. Əs-Səhih, 6/29, h: 4530)

Beləliklə, hər hansı ayənin oxunuşunun nəsx olunduğuna, Qurandan çıxarıldığına dəlil yoxdur. Bəzi sələfilərin bu növ nəsxi qəbul edib digər tərəfdən özlərini az qala Quran fədaisi kimi aparmaları isə yalnız istehzalı təbəssüm doğura bilər.

### 1. 7. Təhrifdən ağır iddia: Qəraniq (durnalar) əfsanəsi

İndi isə Əhli-beyt məzhəbini gözdən salmaq üçün yerli-yersiz hər bir fürsətdən istifadə etməyə, özlərini Quran keşikçisi kimi göstərməyə çalışan sələfilərə öz kitablarında qeyd olunan Qəraniq (durnalar) əfsanəsini xatırlatmaq istəyirik. Qurana, vəhyə və Allah rəsuluna hörmətsizlik sayılan, bütün Quranı sual altına salan bu iftiranın məzmunu belədir:

Peyğəmbər bir gün Qüreyş müşrikləri ilə oturmuşdu, Allahdan müşrikləri uzaqlaşdıracaq bir ayənin nazil olmamasını arzulayırdı. Bu zaman Nəcm surəsi nazil oldu. "Lat və Üzzanı gördünüzmü?! Digər üçüncü (büt) olan Mənatı da həmçinin?!" (Nəcm/19-20) ayələrindən sonra Şeytan Peyğəmbərə iki cümlə təlqin etdi və o da oxudu: "Onlar uca durnalardır. Onların şəfaət edəcəyinə ümid var". Sonra surənin davamını oxudu, axırda o və ordakıların hamısı səcdə etdilər. Vəlid ibn Müğirə isə qoca olub səcdəyə gedə bilmədiyindən yerdən torpaq götürüb alnına qoydu. Hamı, o cümlədən müşriklər Peyğəmbərin bu sözlərindən razı qaldılar. Axşam Cəbrayıl Peyğəmbərin yanına gələndə surəni ona oxudu və sözügedən iki ayəyə çatanda Cəbrayıl dedi ki, bunları mən gətirməmişəm. (Təbəri. Təfsir, 18/663; Təbəri. Tarix, 2/338-339; İbn Səd M. "Ət-Təbəqat əl-kubra", 1/160-161)

Buxari sözügedən iki cümləyə toxunmadan çox qısa şəkildə belə bir hadisə qeyd edir: "Peyğəmbər Nəcm surəsini oxuyandan sonra hamı bir nəfər kimi səcdəyə getdi. Yalnız bir kişi yerdən bir ovuc daş və ya torpaq götürüb üzünə sarı qaldırdı və dedi ki, bu mənə bəsdir.

Abdullah (ibn Məsud) deyir ki, sonralar həmin kişinin kafir halda öldürüldüyünü gördüm". (Buxari. Əs-Səhih, 2/40-41, h: 1067, 1071)

Şiə alimləri və Əhli-sünnə alimlərindən İbn Həzm, Nəvəvi, Fəxr Razi və digərləri qeyri-şiə mənbələrində gəlmiş bu hədisi uydurma hesab edirlər. Onun düzgünlüyünü fərz edən bəzi təfsirçilər də Şeytanın Peyğəmbəri bu şəkildə çaşdırmasını və Peyğəmbərin bilmədən Şeytanın sözlərini təkrarlamasını rədd edirlər. Onların bəzisi deyir ki, Şeytan bu sözləri müşriklərin qulağına çatdırdı, bəzisi deyir ki, yerdəki müşrik və ya münafiqlərdən kimsə bu sözləri söylədi və oradakılar Peyğəmbərin dediyini zənn etdilər. Sələfizmin banisi İbn Teymiyyə isə həm hadisənin doğruluğunu, həm də Peyğəmbərin Şeytanın sözlərini təkrarladığını təsdiqləyib (İbn Teymiyyə Ə. "Minhac əs-sünnə", 1/471) sələflərinin də bu fikirdə olduğunu bildirir. (İbn Teymiyyə. "Məcmu əl-fətava", 10/291-292) Belə çıxır ki, Cəbrayıl vəhyi çatdırdığı zaman Şeytan müdaxilə edib öz fikirlərini təlqin etmiş və Peyğəmbər də bunun fərqində olmayaraq Şeytanın sözlərini vəhy kimi camaata çatdırmışdır. Bu isə bütün əqli və nəqli dəlillərdən əvvəl, elə həmin surənin əvvəlində yer almış iki ayə ilə ziddiyyət təşkil edir: "O, kefi istəyəni danışmır. O (onun sözləri), ancaq (Allah dərgahından) nazil olan bir vəhydir." (Nəcm/3-4)

İbn Teymiyyə Həcc surəsinin 52-ci ayəsinə istinadla yazır ki, bu, mümkündür və baş verdikdə Allah Şeytanın sözlərini ifşa edər. (İbn Teymiyyə. "Məcmu əl-fətava", 10/291-292) Lakin Şeytanın müdaxiləsini məqbul saydıqdan sonra haradan bəlli olar ki, bu ayənin özü onun sözü deyil?! Bu baxımdan, məsələdə ən düzgün yol heç bir əsası olmayan Qəraniq əfsanəsini kökündən rədd etməkdir ki, İbn Teymiyyə bunu etməyib.

Yeri gəlmişkən deyək ki, Salman Rüşdi bədnam Şeytan ayələri romanını məhz bu rəvayət əsasında qələmə alıb, Allahın kitabını təhqir etmişdi.

**Yekun söz**

Yuxarıda deyilənlərdən bəlli oldu ki, Şiə kitablarında Quranın təhrifinə dair 2000 və ya 1000 hədisin olduğu barədə iddia yalan, üstəlik, belə hədislərin səhih olması isə ağ yalandır. İstinad olunan rəvayətlərin çox böyük əksəriyyəti mövzudan xaricdir və qeyri-şiə mənbələrində də yetərincə olan bu rəvayətlər əlavə təfsirlərin çıxarılmasına, qiraət fərqlərinə, mənəvi və ya tərtibatda təhrifə aiddir. Məhz təhrifə dəlalət edən və müvafiq açıqlaması olmayan azsaylı rəvayətlərə gəldikdə isə, qeyri-şiə mənbələrində belə rəvayətlər dəfələrlə çoxluq təşkil edir. Qurana zidd olduğu üçün bu rəvayətlərin hamısı əsassız sayılır və rədd edilir. Bu baxımdan, şiələr sözügedən rəvayətləri çox düzgün və məntiqi şəkildə həll etmiş sayılırlar. Lakin sələfilərin öz uyğun rəvayətlərini heç bir dəlilə əsaslanmayan "Oxunuşun nəsxi" adlı bir fərziyyə ilə həll etmə cəhdləri uğursuz, bəzi nümunələrdə isə hətta imkansız olmuşdur.

## İKİNCİ FƏSİL: ŞEYX SƏDUQDAN ÖNCƏKİLƏRIN RƏYİ

Başqa bir böhtan budur ki, Şeyx Səduq hicri 368–ci ildə əl-Etiqadat kitabını yazana qədər nə bir Əhli-beyt imamı, nə də bir Şiə alimi Quranın təhrif olunmadığını deməyib. Şeyx Səduq da hamının buna görə şiələri məzəmmət etdiyini görüb bu ittihamı rədd edir və yalana əl ataraq deyir ki, kim təhrifə inanmaq fikrini bizə aid etsə, yalançıdır.

Burada Şeyx Səduqu öz arşınları ilə ölçən vəhhabilərdən soruşmaq lazımdır ki, siz hansı dəlilə əsaslanaraq bu iddiaları edirsiniz? Nəyə əsasən deyirsiniz ki, ondan öncə bütün Şiə alimləri Quranın təhrif olunduğunu düşünürdü, Şeyx Səduq da firqəsini vəziyyətdən çıxarmaq üçün bu yalana əl atdı? Bu sual əvvəl-axır onlardan soruşulacaq və o zaman Allah bəndələrinə iftira atanların səsi cəhənnəmin ortasından gələcək.

Əslində, güman ki, Şeyx Səduq bu ittihamla tanış olmuş, Əhli-beytin, həmçinin özünün və digər Şiə alimlərinin bu fikirdə olmadığını əsas götürərək onu rədd etmişdir: "Kim Quranın bundan çox olması fikrini bizə aid etsə, yalançıdır". (Səduq M. Əl-Etiqadat, 84) Şeyx Səduq bu barədə nə müstəqil kitab yazmış, nə də geniş söhbət açmışdır, sadəcə olaraq, imla şəklində dediyi və digərlərinin yazdığı "Şiə etiqadları" kitabında Quranın təhrif edilməməsi fikrinə qısa işarə vurmuşdur. Bunun özü göstərir ki, sözügedən ittiham onun dövründə də ciddi olmamışdır və vəhhabilərin uydurma təhlillərinə heç bir əsas yoxdur. Üstəlik, tarixi faktlar da bu "kəşf"in qərəzli olduğunu sübut edir. Belə ki, Səduq şiə ailəsi olan Ali-Buyənin hakimiyyəti dövründə

yaşayıb, əmirlərin şəxsi himayəsində olub, bu kitabı isə sülalənin ən qüdrətli hökmdarı Əmir Əzüd əd-dövlənin vaxtında yazıb. Əgər o, Quranın təhrif olunduğunu düşünsəydi, bunu gizlətməz, bundan ötrü yalan danışmaz və siyasi imkanlardan istifadə edib hər yerdə fikrini əsaslandırar, müxaliflərə isbat edərdi. Göründüyü kimi, hər hansı təhlükə olmadığı üçün təqiyyəyə də əsas yoxdur.

**2. 1. Əhli-beyt imamları**

Əhli-beyt imamlarının Quranın təhrif olunmadığı haqda fikirlərinə gəlincə isə, İmam Əli və İmam Həsənin 5 ildən artıq sürən xilafətlərindən başlaya bilərik. Allah-Taalanın bu qədər təkidlə nazil etdiyi, dönə-dönə tapşırdığı kitabının təhrifi kiçik məsələdir ki, onlar çıxarılmış ayələrin bərpasına heç bir cəhd etməsinlər?! Əgər Əhli-beyt Quranın təhrif olunduğunu düşünsəydi, ən azı xilafətləri zamanı bunu bildirər və müsəlmanları əsl Quranla tanış edərdilər. Halbuki belə bir hal baş verməyib, onlar da bu gün əlimizdə Quran ayələrini oxumuş, həmin ayələrlə hökm çıxarmışlar. Xəlifə olmuş bu iki imam Quranın sözlərinin yox, məna və məğzinin təhrif olunduğunu, cəmiyyətin Quran yolundan uzaq düşdüyünü düşünür və imkanlarını ümmətin kəmiyyət deyil, keyfiyyət artımına sərf edirdilər. Allahın rəsulu bu haqda İmam Əliyə işarə edərək buyurmuşdur: "Mən Quranın tənzili (nazil olması) üçün vuruşduğum kimi, sizin aranızdan biri də onun təvili üçün vuruşacaq". (Əhməd, 17/360, 391; 18/296; Albani M. "Silsilə əhadis əs-səhihə", 5/639-640)

Mötəbər kitablarda İmam Əlinin, ona yaxın səhabələrin və digər Əhli-beyt imamlarının ilk xəlifələr haqda bəzi tənqidləri yer almışdır. Lakin onların arasında Quranın təhrifinə dair etiraz gözə dəymir. Halbuki bunun əhəmiyyəti nəinki digər məsələlərdən, heç xilafətdən də az deyil. Digər tərəfdən, bəzi saxta hədisləri çıxmaq şərtilə, onlar heç bir yerdə Əhli-beytin xeyrinə, yaxud səhabələrin əleyhinə hansısa bir cümləyə istinad edib onun təhrif olunmuş ayələrdən olduğunu söyləməmişlər.

İmam Əli Quranın mötəbərliyinə və kənar müdaxilələrdən qorunmasına işarə vuraraq buyurur: “Sizin aranızda olan Allah kitabı dili yorulmaq bilməyən natiq, dirəkləri xarab olmayan bir evdir”. (Nəhcül-bəlağə, xütbə: 133)

İmam Baqir Səd əl-Xeyrə yazdığı məktubunda müsəlmanların Quranın ayələrini diqqətlə qoruduqlarını, amma mənasını təhrif etdiklərini açıq-aşkar bildirirdi: “(Allahın) kitabından üz çevirməyin bir növü belədir ki, hərflərini qoruyub, hədlərini (mənalarını) təhrif edirlər. Rəvayət edirlər, lakin riayət (və əməl) etmirlər. Cahillər onun rəvayətinin qorunduğuna sevinir, alimlər isə ona əməl olunmadığına görə kədərlənirlər”. (Kuleyni, 8/53)

İmam Baqir Quranın müxtəlif həcmlərdə deyil, eyni olduğunu bildirərək buyurur: “Quran birdir, Bir olan tərəfindən bir nəfərə nazil olub. Fərqlər isə yalnız rəvayətçilərə görədir”. (Kuleyni, 2/630) Eyni hədisi Şeyx Səduq İmam Sadiqdən nəql etmişdir. (Səduq. Əl-Etiqadat, 86) Bu və eyni məzmunlu digər hədislər göstərir ki, Quran təhrifə uğramayıb, fərqlər isə yalnız rəvayətçilərə - onu fərqli qiraət edənlərə görədir.

Məlum olduğu kimi, Quranın təhrif edildiyini düşünənlər imamların, xüsusən də İmam Əlinin adının çıxarıldığını iddia edirlər. İmam Sadiq isə Quranda heç bir imamın adının olmadığını açıq-aşkar bildirir və bu yanlış düşüncəni kökündən rədd edir. Ondan “Əlinin və Əhli-beytin adları nə üçün Quranda qeyd olunmayıb?” – deyə soruşanda cavab verir ki, Allah namaz haqda ayə göndərib, amma onun üç, yoxsa dörd rəkət olduğunu deməyib. Bunu Allahın rəsulu təfsir edib. “Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin” ayəsində Əlinin və Əhli-beytin nəzərdə tutulduğunu da Peyğəmbər söyləyib. (Kuleyni, 1/286-287)

Şeyx Müfidin İmam Baqirdən nəql etdiyi bir hədisdə də belə deyilir: “(Mehdi) qiyam edəndə Quranı Allahın nazil etdiyi kimi tədris edənlər üçün çadırlar quracaq. Əlimizdəki Quran tərtib (düzülüş) baxımından fərqli olduğu üçün əzbərləməsi çətindir”. (Müfid M. Əl-

İrşad, 2/386) Göründüyü kimi, bu hədis də Quranın təhrif olunmadığını və yalnız tərtib baxımından nazilolma ardıcıllığı ilə toplanmadığını göstərir. Bu isə hamının bildiyi və qəbul etdiyi məsələdir.

Əhli-beyt imamlarının Quranın təhrif olunmadığı haqda sözlərindən bir qismi hədislərin Quranla ölçülməsi, dəyərləndirilməsi barədə buyruqlarıdır. (Bax: Hürr Amili. "Vəsail əş-Şiə", 27/109-124) Müxtəlif Şiə mənbələrində yer alan çoxsaylı belə hədislərin birində İmam Sadiq buyurur: "Qurana müvafiq olmayan hər bir hədis cəfəngiyatdır". (Kuleyni, 1/69) Bu söz hədisləri Quranla deyil, Quranı hədislərlə ölçən və beləliklə də bəzən təhrif fikrilə nəticələnən Əxbari düşüncəsi ilə daban-dabana ziddir. Bu qədər böyük sözü söyləməkdən ötrü ilk öncə Quranın təhrif olunmadığını, toxunulmaz və dəyişməz meyar olduğunu qəbul etmək lazımdır ki, heç şübhəsiz, imamlar bunu qəbul etmişlər.

Başqa bir hədis onuncu imam həzrət Hadidəndir. Onun sözlərini olduğu kimi tərcümə edirik: "Ümmətin hamısı yekdilliklə Quranın haqq olmasına dair icma etmişlər. Bütün firqələrə görə, onda heç bir şübhə yoxdur... Onların arasında Quranın tənzil və təsdiqi barədə fikir ayrılığı mövcud deyil". (İbn Şöbə Hərrani H. "Tuhəf əl-uqul", 458)

Əhli-beyt imamlarının Quranın təhrif olunmadığını bildirən sözləri çox, onların hamısını qeyd etmək imkansızdır. Həm də nəzərə almaq lazımdır ki, o zaman Quranın söz təhrifi deyil, məna təhrifi və şəxsi rəyə əsaslanan təfsiri daha aktual olub. Bu baxımdan, bu növ təhrif və təfsirləri qadağan edən hədislərin daha çox olması da təbiidir. Nümunə üçün, İmam Sadiq buyurub: "Quranı öz rəyinə uyğun təfsir edənin təfsiri təsadüfən düz çıxsa belə, ona savab verilməz". (Əyyaşi M. Təfsir, 1/27) O dövrün təfəkkür tarixini araşdırdıqda və müsəlmanları düşündürən məsələlərlə tanış olduqda bu nəticəyə gəlirik ki, o zaman əsas problem Quran ayələrinin yanlış izahı və mənəvi təhrifi olmuşdur və imamlar da əsasən bu məqam üzərində dayanmışlar.

Bununla yanaşı, biz yuxarıda Əhli-beyt imamlarının uyğun sözlərindən nümunələr qeyd etdik. Görəsən sələfilər öz sələflərindən nə qədər belə nümunə gətirə bilərlər? Məsələn, Quranın dəyişdirilmədiyinə dair Xəlifə Əbu Bəkr, Ömər və ya Osmandan bir səhih sitat gətirə bilərlərmi?! Halbuki bunun əksinə nümunə var: ikinci xəlifə ömrünün sonlarında da rəcm ayəsinin Qurandan çıxarıldığına təəssüf edir, Peyğəmbərin sağlığında bu ayənin oxunduğunu bildirir və onu yenidən Qurana daxil etmək istəyini ifadə edirmiş. Yaxud sələfilərin sevimli şahları olan Müaviyə və Yezid harada Quranın təhrifə məruz qalmadığını, Allah tərəfindən nazil olduğu kimi bizə çatdığını bildirmişlər? Biz Əhli-beyt imamlarına irad bildirərək onların Quranın təhrif edilmədiyinə dair bir söz demədiklərini iddia edən sələfilərə cavab verdik. Əhli-beyt imamlarının dedikləri isə Peyğəmbərin öyrətdikləri və ondan irs aldıqlarıdır. İndi isə sələfilər öz kitablarından Quranın dəyişdirilməyəcəyinə dair Peyğəmbərdən və məzhəb imamlarından səhih rəvayətlər söyləsinlər.

**2. 2. Şiə alimləri**

Əhli-beyt imamlarından əlavə, onların səhabələri, yəni Şiə alimləri də Quranın təhrif olunmadığını bildirmişlər. Lakin qədim kitabların əksəri bizə çatmadığından, yaxud olduğu kimi çatmadığından onlara qəti istinad etmək olmur. Hər halda, dörd imamın səhabəsi olmuş Fəzl ibn Şazanın əl-İzah kitabında bu haqda geniş söhbət açılmışdır. O, Quranın təhrifinə dair səhabələrə aid edilən Əhli-sünnə rəvayətlərini – biz onların bəzisini yuxarıda qeyd etdik – tənqid edir, bunu səhabələrə böhtan və Allaha qarşı cəsarət adlandıraraq Quranın təhrif olunmadığını söyləyir, ayələrin mütəvatir şəkildə deyil, iki səhabənin təsdiqi ilə Qurana salınmasına dair rəvayətlərə etirazını bildirirdi. (Fəzl ibn Şazan, 209-229) Təəssüf ki, Mühəddis Nuri onu düzgün anlamamış və Əhli-sünnə mənbələrindən

gətirdiyi dəlilləri qəbul etdiyini sanaraq Quranın təhrifinə inandığını bildirmişdir.

Burada Osman əl-Xəmisin Əhli-beyt imamlarına tutduğu bir irada qısa cavab vermək istəyirik. Əl-Xəmis deyir ki, nə üçün sizin imamlarınız Quran qiraətini rəvayət etməmişlər. Əvvəla, suala sualla cavab vermək olar: digər dörd məzhəb imamının hansı biri Quranı rəvayət etmişdir? O zaman bununla məşğul olan qiraətçilər vardı və biz yuxarıda dedik ki, mövcud qiraət İmam Əliyə çatan bir Şiə qiraətidir. İkincisi, məgər qiraət etsəydilər, nə dəyişəcəkdi?! Qəbul edəcəkdilərmi onların qiraətini? İmam Əli Quranı toplamasaydı, deyəcəkdilər ki, nə üçün bu qədər mühüm işi görməyib? Məhz bunun əhəmiyyətinə görə Peyğəmbərin vəfatından sonra imam tez bir zamanda Quranı kitab şəklində topladı, amma qəbul olunmadı. Üstəlik, bu gün bəzi nadanlar onun topladığı Quranın bəzi tərtibat fərqlərini anlamayıb təhrif nəğmələri oxuyurlar. İmamların fərqli qiraətləri olsaydı, eyni vəziyyət yaranmayacaqdımı?! Məgər Əhli-beyt məzhəbinə qarşı bəzi təhrif iddiaları elə qiraət fərqlərinə görə deyilmi?!

## ÜÇÜNCÜ FƏSİL: FƏRQLİ QURAN İTTİHAMI

Sələfizmin banisi İbn Teymiyyə (1263-1328) əsrlər öncə yazırdı ki, yəhudilər Tövratı təhrif etdikləri kimi, şiələr də Quranı təhrif etmişlər. (İbn Teymiyyə. "Minhac əs-sünnə", 1/25.) Vəhhabi sələfiliyinin banisi Məhəmməd ibn Əbdülvəhhab (1703-1792) isə yazırdı ki, deyilənə görə, bugünkü şiələr Quranın sonuna Nureyn və Vilayət adlı iki surə əlavə ediblər. (Məhəmməd ibn Əbdülvəhhab, 1/14) Bu iddiaların həqiqətdən uzaq olması bu gün heç kimə sirr deyil. Nə indi, nə də tarixin hər hansı dönəmində şiələrin fərqli Quranı olmayıb və bunu təsdiq edəcək heç bir fakt yoxdur. Sayı 400 milyonu ötmüş şiənin birində də fərqli Quran yoxdur. Belə mühüm məsələlərdə qeyri-dəqiq məlumatlara, hansısa deyilənlərə güvənib nə qədər müsəlmanın günahına girmək, digər tərəfdən də, Quranı təhrif edənə təkfir hökmü çıxarmaq İslama, insafa, həqiqətə, ədalətə nə qədər uyğundur? Bunu oxucunun öhdəsinə buraxırıq.

Ən acınacaqlısı budur ki, rabitə və informasiya mübadiləsinin bu qədər inkişaf etdiyi, sürətləndiyi bugünkü dövrdə də eyni ittihamı səsləndirənlər var. Bunu xəstə xislətli insanların İslama və ümmətə xəyanəti adlandıran müasir əhli-sünnə alimi Şeyx Məhəmməd Qəzzali yazır: "Belələrinin biri bir elmi toplantıda dedi ki, şiələrdə məşhur Quranımıza nisbətən bəzi artıq-əskikliyi olan başqa bir Quran vardır. Mən ondan soruşdum ki, bu Quran haradadır? Üç qitəyə uzanmış İslam dünyasında 14 əsrdir əvvəli, sonu, surə, ayə və sözləri bəlli olan bir Qurandan başqası görünməyib. Bəs bu fərqli Quran haradadır? Bu qədər uzun müddət ərzində nə üçün bir cinni-ins onun bir

nüsxəsindən də xəbər tutmayıb?” (Qəzzali M. “Difa ən əl-əqidə və əş-şəriə”, 216)

# DÖRDÜNCÜ FƏSİL: ŞİƏ ALİMLƏRİNİN QURANIN TƏHRİFİ BARƏDƏ FİKİRLƏRİ

Bəzi iddia və iftiralara görə, əksər Şiə alimləri Quranın təhrif olunduğunu söyləmişlər. Hətta bir qədər də irəli gedərək Şiə alimlərinin bu haqda icma etdiklərini, yekdil rəyə malik olduqlarını iddia edənlər də tapılır.

Təbii ki, bütün, yaxud əksər Şiə alimlərinin uyğun fikirdə olması iddiası ağ yalandan və ya çox kobud səhvdən başqa bir şey deyil. Lakin həm şiə, həm qeyri-şiələrdən bu düşüncədə olub Quranın təhrif edildiyinə – bəzi ayələrin çıxarıldığına inananlar olub.

İslam tarixi boyu yüzlərlə böyük Şiə alimi gəlib-getmiş, ümumilikdə təfsirə və Quran elmlərinə dair şiələr tərəfindən beş mindən çox kitab və risalə yazılmışdır. Təbii ki, burada onların hamısının Quran barədə fikirlərini araşdırmağa lüzum və imkan yoxdur. Biz Şiə tarixini 3 hissəyə bölərək əvvəlcə Əxbariliyə qədərki, sonra Əxbari dövründəki, daha sonra isə Əxbarilikdən sonrakı ən əsas Şiə alimlərinin fikirlərinə nəzər salacağıq:

## 4. 1. Əxbariliyə qədərki əsas Şiə alimləri

### 4. 1. 1. Əli ibn İbrahim Qumi (vəfatı: 919)

Əli ibn İbrahim Qumi həqiqətən mötəbər Şiə alimi olub. Lakin məsələ burasındadır ki, bu gün ona aid edilən təfsirin hamısını o yazmayıb, hansı hissələrini yazması da bəlli deyil. Təfsiri ikinci bir adamın qələmə aldığı bəzən aydın gözə çarpır. Bəzi yerlərdə atası

İbrahimdən vasitə ilə hədis nəql olunur ki, bu da kitabın onun özü tərəfindən imla üsulu ilə yazıldığını inkar edir. Üstəlik, bəzi rəvayətlər açıq-aşkar Qurana, ağla və Şiə etiqadlarına ziddir ki, bu da Əli ibn İbrahimin şəxsiyyəti ilə heç cür uyğun gəlmir. Eyni zamanda bir çox yerlərdə sapqın Əbülcarudun təfsirində mövcud olan zəif və saxta rəvayətlər qeyd olunmuşdur. Bu gün alim və tədqiqatçılar bu kitabın ona aid edilməsini məqbul saymırlar. Bu baxımdan, bu növ kitablardan sitat gətirib Şiəni ittiham etmək absurddur.

Müəllifə nisbəti şübhə doğuran belə kitablar qeyri-şiələrdə də var. İmam İbn Qüteybəyə (828-889) aid edilən "İmamət və siyasət" kitabı belə nümunələrdəndir. İki ayağını bir başmağa dirəyib "Qumi təfsiri"ndə yazılanların hamısını Əli ibn İbrahim Qumiyə aid edənlər "İmamət və siyasət" kitabında yazılanları da İbn Qüteybəyə aid etməlidirlər. Lakin bu zaman sələfi etiqadından nəsə qalacaqmı? Bax bu, sual altındadır.

Sual oluna bilər ki, müəllifin nə fərqi var; hər halda, bu təfsir bir Şiə aliminə məxsusdur. Cavab olaraq deyirik ki, bu da bəlli deyil. Bu kitabda ğülüvv edən – Peyğəmər və ya imamları ilahiləşdirən çoxlu rəvayətçilərdən uydurma hədislər nəql olunmuşdur. Bu baxımdan, gerçək müəllifin də ğali olması ehtimalı var və ğalilik nəinki Şiəliyə, heç İslama dəxli olmayan azğın bir cərəyandır.

#### 4. 1. 2. Məhəmməd ibn Məsud Əyyaşi (vəfatı: 932)

Əyyaşi təfsirində araşdırma əsasında bəlli olub ki, Nurinin və onun ardınca Ehsan İlahi Zəhirin təhrifə aid etdiyi 90 rəvayətdən yalnız 2-i buna aid ola bilər. (Həddadian Ə. "Əl-Kafi və Əyyaşi təfsiri kitablarında təhrif rəvayətlərinin araşdırılması". Magistr dissertasiyası. Qum universiteti, 2008) 1700-dən artıq rəvayəti olan bir kitabın yalnız 2 zəif rəvayətinə görə isə müəllifi ittiham etmək olmaz; üstəlik, bu 2 rəvayət Qurani-kərimə və digər çoxlu rəvayətlərə ziddirsə. Çünki müəllif kitabının müqəddiməsində rəvayətlərin dəyərləndirilməsində onların Qurana uyğunluğunu meyar saymışdır.

Sözügedən iddiaçılar iddialarına uyğun hədislərin sayını artırmaq üçün bəzən elə rəvayətləri təhriflə bağlamışlar ki, adam təəccübdən donub qalır. Misal üçün, bu təfsirdə deyilir ki, İmam Sadiq Həmd surəsinin üçüncü ayəsini "Məliki yəumid-din" şəklində qiraət edirmiş. (Əyyaşi, 1/22; Nuri, 201; Ehsan İlahi Zəhir, 168) Yaxud başqa bir yerdə deyilir ki, İmam Sadiq Yusif surəsinin 110-cu ayəsinin (كذبوا) sözünü təşdidsiz olaraq "kuzibu" kimi oxuyurmuş. (Əyyaşi, 2/201; Nuri, 244; Ehsan İlahi Zəhir, 242-243) Halbuki əlimizdəki Quranın yazılışı da məhz belədir: “məliki” əlifsiz, "kuzibu" təşdidsiz. Bunların və bunlar kimi digər 8 hədisin təhriflə əlaqəsizliyi gün kimi aydın olduğu üçün Mühəddis Nurinin və sözügedən sələfilərin təfəkkür tərzinə nə ad vermək olar, bilmirik.

**4. 1. 3. Şeyx Kuleyni (864-940)**

Yuxarıda əl-Kafi kitabının hədislərini araşdırarkən gördük ki, Məhəmməd ibn Yəqub Kuleyninin ittiham olunduğu hədislərin heç biri Quranın təhrifinə dəlalət etmir. Təbii ki, həm Şiə, həm Əhli-sünnə kitablarında açıq-aşkar təhrifə dəlalət edən rəvayətlər vardır, heç şübhəsiz, Kuleyni də onları görmüş, lakin nəinki kitabında yazmamış, hətta təhrifi – Quran ayələrinin artırılıb-azaldılmasını inkar edən çoxlu hədisləri yazmışdır. Bir qədər yuxarıda İmam Sadiqin, uyğun fikri kökündən rədd edən hədisini qeyd etdik. Kuleyninin yazdığına əsasən, İmam Sadiq “Əlinin və Əhli-beytin adları nə üçün Quranda yoxdur?” – deyə soruşana cavab verir ki, Allah namaz haqda ayə göndərib, amma onun üç, yoxsa dörd rəkət olduğunu deməyib, bunu Allahın rəsulu təfsir edib. “Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!” ayəsində Əlinin və Əhli-beytin nəzərdə tutulduğunu da Peyğəmbər söyləyib. (Kuleyni, 1/286-287.)

Ayətullah Xoi bu hədis barədə deyir: “Bu səhih hədis bütün belə hədislərə hakimdir və onların məqsədini açıqlayır”. (Xoi Ə. “Əl-Bəyan fi təfsir əl-Quran”, 232) Yəni imamlar Quranda adla deyil, işarə və xüsusiyyətlərlə tanıtdırılmışlar.

Lakin əl-Kafidə təhrif hədisləri olsaydı belə, bunu Kuleyninin fikri kimi qələmə vermək düzgün olmazdı. Çünki bu kitabda təhrifi inkar edən hədislər də var. Bunu bir qədər açıqlayaq.

Vəhhabilər deyirlər ki, Kuleyni əl-Kafinin müqəddiməsində yalnız səhih hədisləri topladığını yazmışdır; deməli, hər bir hədisdə mövcud fikir həm də Kuleyninin fikri hesab olunmalıdır. Bu da növbəti savadsızlıqdan, ya da bəhanədən başqa bir çey deyil. Əl-Kafidə kifayət qədər ziddiyyətli hədislər var. Bu zaman onların hansını müəllifin fikri hesab etməliyik?! Təsadüfən, yuxarıda qeyd etdiyimiz hədislər arasında da beləsini gördük. Bir hədisdə deyilir ki, Fatimə müshəfində bir Quran ayəsi belə yoxdur, digər hədisdə isə bir ayənin Fatimə müshəfində filan formada qeyd olunduğu göstərilir. İndi Kuleyninin fikrini necə təyin edə bilərik: Kuleyniyə görə, Fatimə müshəfində Quran ayəsi varmı, yoxmu? Müəllif öz meyarlarına əsasən, səhih bildiyi hədisləri qeyd etməklə kifayətlənib, aralarındakı ziddiyyəti həll etməyibsə və öz fikrini açıq şəkildə ortaya qoymayıbsa, onun hansı mövqedə olduğunu təyin etmək mümkün deyil. Təbii ki, onun meyarları kökündən yanlış ola, səhih yerinə zəif hədisləri yaza da bilər, amma indi söhbətin mövzusu bu deyil. Yuxarıda isə Kuleyninin Əhli-beyt imamlarının Quranın təhrif edilməməsinə dair hədislərindən bəzi nümunələri gördük. Həm də o, əl-Kafinin müqəddiməsində yazdığı "Hədisləri Allahın kitabı ilə tutuşdurun; düz gələni götürün, zidd olanı rədd edin" (Kuleyni, 1/8) hədisi ilə özünün əsas meyarını bəyan etmişdir.

Bütün deyilənlərdən əlavə, yenə də təkrar edirik ki, "rəcm ayəsi" hədisi kimi qeyri-şiə mənbələrindən daxil olanları çıxmaq şərtilə, Kuleyninin əl-Kafidə topladığı hədislərin heç biri Quranın təhrif olunduğuna əsas vermir. Hələ üstəlik, müəllifin də belə bir fikirdə olduğunu söyləmək isə, yumşaq desək, xüsusi insafsızlıq tələb edir.

### 4. 1. 4. Şeyx Səduq (923-991)

Biz ikinci ittihama cavab verərkən Məhəmməd ibn Əli Səduqun Quranın təhrifinə dair fikrinə toxunduq. O yazır: "Etiqadımız budur ki, Allah-Taalanın Öz peyğəmbəri Məhəmmədə göndərdiyi Quran iki cild arasında və xalqın əlində olandır, ondan artıq deyil... Kim ondan artıq olması fikrini bizə aid etsə, yalançıdır". (Səduq. Əl-Etiqadat, 84)

**4. 1. 5. Şeyx Müfid (948-1022)**

Vəhhabi sələfilərinin iftiralarına məruz qalan Şiə alimlərindən biri Məhəmməd ibn Məhəmməd Müfiddir. Onlar şeyxin sözlərinin bir hissəsini kontekstdən çıxararaq Quranın təhrif olunduğunu, bəzi hissələrinin azaldığını təsdiqlədiyini iddia etmişlər. (Bax: Malullah M. "Əş-Şiə və təhrif əl-Quran", 63, 72; Əs-Seyf M. "Əş-Şiə əl-İsna əşəriyyə və təhrif əl-Quran", 18) Əslində isə Şeyx Müfid yazır:

"Əhli-beyt imamlarından Quranın fərqləndiyinə, müəyyən hissələrinin çıxarıldığına dair müstəfiz (vahid həddini aşan və mütəvatir həddinə çatmayan) hədislər söylənmişdir. İmamiyyə şiələrinin bir hissəsi deyir ki, Quranın nə bir surəsi, nə bir ayəsi və nə bir sözü dəyişilib. İmam Əlinin müshəfində olub, mövcud Qurandan çıxarılan hissələr isə Qurana açıqlama kimi nazil olan və möcüzəvi Quran vəhyindən sayılmayan təfsir və təvillərdir... Mənim üçün bu söz məhz Quran sözlərinin azaldığını iddia edənlərin fikrindən daha doğrudur və MƏN BUNU MƏQBUL SAYIRAM". (Müfid M. "Əvail əl-məqalat", 80-81)

Göründüyü kimi, burada Müfidin fərqli fikri təhrif hədislərinin müstəfiz həddində olduğunu söyləməsi, eləcə də Şeyx Səduqdan fərqli olaraq, Quranın dəyişmədiyi barədə fikri şiələrin hamısına aid etməməsidir. Bununla yanaşı, o öz mövqeyini ortaya qoyaraq bu növ hədisləri qəbul etmədiyini və Quranın təhrif olunmadığını açıqca bildirmişdir. Vəhhabi alimləri isə onun şəxsi mövqeyinin ifadəsi olan son hissəni görməzdən gəlir və müsəlmana yaraşmayan tərzdə fikrini təhrif etmiş olurlar.

Şeyx Müfidi təhrif düşüncəsində ittiham edən Vəhhabi alimi Ehsan İlahi Zəhir isə onun başqa bir cümləsinə istinad edir: “Əlimizdəki Quranın hamısı Allah kəlamıdır... Allahın (Quran olaraq) nazil etdiyinin qalanı isə şəriət keşikçisində (İmam Mehdidədir)”. (Ehsan İlahi Zəhir, 45; Müfid M. “Əl-Məsail əs-sərəviyyə”, 78) İlk baxışdan Quranın azaldığını bildirən bu sözlər əslində iddiaya yetərli deyil. Əvvəla, kitabın əsas nüsxələrində “قرآنا” – yəni “Quran olaraq” sözü yoxdur və min il yaşı olan bir kitab haqda mühakimə yürüdərkən belə fərqləri nəzərə almaq vacibdir. İkincisi, hətta bu söz olsa belə, Müfidin yuxarıdakı fikrindən də bilirik ki, sonuncu imamda olan Quran İmam Əlinin topladığı, həm də təfsir və təvili, nasix və mənsuxu qeyd olunmuş Qurandır. Onun Quran haqqındakı sözlərinə kompleks baxış sübut edir ki, “Quran olaraq nazil etdiyi” dedikdə məqsədi həm də Quranın təfsiri və təvili olaraq vəhy olunanlardır. Üçüncüsü, uyğun cümlənin yer aldığı doqquzuncu məsələ “Quranın təhrifdən qorunması” adlanır və Müfid elə oradaca yazır: “Əgər kimsə “hazırkı Quranın artırılıb-azaldılmadığını necə söyləmək olar, halbuki siz imamların “ümmə” sözünü “əimmə” kimi... oxuduğunu rəvayət edirsiniz?!” desə, cavab verilər ki, vahid rəvayətlər olduğu üçün bunları qəbul edə bilmərik. Bundan əlavə, ayənin hər iki qiraətlə nazil olması da mümkündür. (Müfid. “Əl-Məsail əs-sərəviyyə”, 82-84)

Sonda bir məqamı da xatırlatmaq olar. Şeyx Müfid Şeyx Səduqun əl-Etiqadat kitabına şərh yazaraq razılaşmadığı məqamlara dair fərqli fikrini ortaya qoymuş, lakin onun Quranın təhrif olunmadığı ilə bağlı çox qəti və şəffaf mövqeyinə heç bir etiraz etməmişdir. Bütün bu faktlar isə göstərir ki, Şeyx Müfid Quranın təhrif olunduğunu düşünməmişdir, milli və əcnəbi vəhhabilərin uyğun iddiaları isə iftiradan başqa bir şey deyil.

**4. 1. 6. Seyid Mürtəza (965-1044)**

Öz dövründə Şiə dünyasının rəhbəri olmuş Əli ibn Hüseyn Mürtəza Quran haqda deyir: “Quran nə azalıb, nə də dəyişdirilib...

Müsəlmanlar arasında Quranı oxumağa və qorumağa böyük diqqət və maraq olmuşdur... İslam alimləri onu qorumağa son dərəcə səy göstərmiş, hərəkələrinə və müxtəlif qiraətinə dair hər bir fikir ayrılığını bilmişlər. Belə olan halda Quran necə dəyişdirilə və ya azaldıla bilərdi?!.. Quran Peyğəmbərin dövründə indiki formada toplanmışdı və tədris olunurdu". (Mürtəza Ə. "Əz-Zəxirə fi elm əl-kəlam", 361-363)

### 4. 1. 7. Şeyx Tusi (996-1067)

Məzhəbin şeyxi ləqəbi ilə məşhur olan Məhəmməd ibn Həsən Tusi Qurani-kərimə yazdığı təfsirində bildirir: "Qurana heç bir şeyin artırılmadığına dair icma – yekdil rəy vardır. Görünən budur ki, müsəlman məzhəbləri Quranın azalmadığını da düşünürlər. Bizim məzhəbimizin (Şiəliyin) düzgün rəyinə uyğun olan da budur. Mürtəza bunu təsdiqləmişdir və rəvayətlərdən də belə başa düşülür. Düzdür, Şiə və Əhli-sünnə rəvayətçiləri tərəfindən Quranın çoxlu ayələrinin çıxarıldığını və ya yerlərinin dəyişdirildiyini göstərən çoxlu rəvayətlər nəql olunmuşdur. Lakin onlar vahid rəvayətlər olduğundan elm və əməl üçün mötəbər sayılmırlar və daha yaxşısı onları tərk etməkdir". (Tusi. Ət-Tibyan, 1/3)

### 4. 1. 8. Əbu Əli Fəzl Təbrisi (1076-1154)

Əbu Əli Fəzl Təbrisi yazır: "Qurana heç bir şeyin artırılmadığına dair icma – yekdil rəy vardır... Bizim alimlərimizin düzgün mövqeyi budur ki, Quranda dəyişiklik və azalma da baş verməyib". (Təbrisi F. "Məcmə əl-bəyan", 1/43)

### 4. 1. 9. Əhməd Təbrisi

Əl-İhticac kitabının Şiə dünyasında geniş yayıldığını nəzərə alaraq, onun müəllifini də əsas alimlər sırasında qeyd edirik. Əslində isə, Əhməd Təbrisi kimi təqdim olunan müəllif hələ də tanınmaz olaraq qalır, onun kimliyinə dair çoxlu versiyalar irəli sürülmüşdür.

Üstəlik, bu kitab rəvayətçiləri qeyd olunmayan və özündən qabaqkı mötəbər kitablarda yazılmayan sənədsiz rəvayətlərdən ibarətdir, istinadı bəlli olmayan daha zəif bir kitabdan – Süleym ibn Qeys Hilalinin kitabından iqtibaslarla doludur. Əl-İhticac elmi baxımdan o qədər zəifdir ki, hətta bəzi Əxbari alimləri də ona istinad etməyiblər. Belə olan halda, hansı Şiə kitabından danışmaq və hansı üzlə onda yazılanları Şiə etiqadı kimi qələmə vermək olar?!

**4. 1. 10. Əbülfutuh Razi (1078-1157)**

Əbülfutuh Razi təfsir kitabında Hicr surəsinin 9-cu ayəsini belə şərh edir: "Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu artma, azalma, itmə və məhvolmadan qoruyub saxlayacağıq! Necə ki, buyurub: "Nə öncə, nə də sonra batil ona yol tapa bilməz". (Əbülfutuh Razi H. "Rövz əl-cinan", 11/311)

**4. 1. 11. İbn Şəhr Aşub (1096-1192)**

Mühəddis Nuri Quranın təhrifinə dair kitabında yazır ki, deyilənə görə, İbn Şəhr Aşub əl-Məsalib kitabında Vilayət adlı bir surənin bütünlüklə Qurandan çıxarıldığını bildirmişdir. Nurinin sözlərindən də aydın olur ki, o, sözügedən kitabı görməmişdir. Böyük ehtimalla, İbn Şəhr Aşubu ilk dəfə belə bir düşüncədə ittiham edən isə sələfi təfsirçi Alusidir. (Alusi, 1/25) Quranşünas alim Ayətullah Mərifət Quranın təhrifdən qorunduğuna dair yazdığı əsərində deyir ki, mən əl-Məsalib kitabının bu yaxınlarda tapılan iki əlyazmasını diqqətlə oxudum, amma belə bir fikirdən əsər-əlamət görmədim. Əksinə, müəllif nəinki tam bir surənin, hətta bir sözün də təhrif edildiyini qətiyyətlə inkar etmişdir. (Mərifət M. "Siyanə əl-Quran min ət-təhrif", 163-164)

İbn Şəhr Aşub başqa bir kitabında da təhrif iddialarını açıq-aşkar rədd etmiş, heç bir dəyişiklik və təhrifə məruz qalmadığını bildirmişdir: "Doğrusu budur ki, Qurana əlavələrdən söhbət açan rəvayətlər təvil (və təfsir) barədədir. Nazil olmuş (Quran vəhyi) isə nə

azalıb, nə də çoxalıb". (İbn Şəhr Aşub. M. "Mütəşabih əl-Quran və müxtəlifuh", 2/77)

**4. 1. 12. Seyid ibn Tavus (1193-1266)**

Seyid Əli ibn Tavus məşhur Mötəzilə mütəkəllimi Əbu Əli Cübbainin Quranın təhrifi ilə bağlı ittihamlarına cavab olaraq yazır: "Quranın dəyişdirilməsini siz və sələfləriniz iddia edirsiniz, rafizilər deyil". (Seyid ibn Tavus Ə. "Səd əs-süud", 145) Başqa bir yerdə isə yazır: "Ağıl və şəriətə görə, Quranın artma və azalmadan qorunmuş olması labüddür". (Yenə orada, 193)

**4. 1. 13. Əllamə Hilli (1250-1325)**

Əllamə Hilli ləqəbli böyük Şiə alimi Həsən ibn Mütəhhər yazır: "Quranda dəyişiklik baş verməmiş, o çoxalmamış və azalmamışdır. Belə bir etiqada malik insandan Allaha sığınırıq! Belə etiqadlar Peyğəmbərin mütəvatir şəkildə nəql olunan möcüzəsini etibardan sala bilər". (Hilli H. "Əcvibə əl-məsail əl-məhnaiyyə", 121)

**4. 1. 14. Mühəqqiq Kərəki (1464-1533)**

Səfəvi dövlətinin əvvəlində Baş qazi vəzifəsində çalışmış Mühəqqiq Kərəki – Əli ibn Əbdülali yazır: "Hədis Qurandan, mütəvatir sünnədən və ya icmadan olan qəti dəlilə zidd olarsa, təvili və başqa açıqlaması mümkün olmadığı təqdirdə tərk edilməsi vacibdir... Hədislər bu Quranla ölçülməlidir. Lakin azalma hədisləri ona ziddir, çünki onun əsl Quran olmadığını göstərir. Bundan böyük təkzib ola bilərmi?!.. İmamların Quranın dəyişdirilməsi haqda fikirləri isə onun təfsir və təvilinin təhrifi ilə bağlıdır". (Əl-Ərəci M. "Şərh əl-Vafiyə". Quranın höccət olması fəsli. Sitatın götürüldüyü ədəbiyyat: Mərifət, 66-67.)

**4. 2. Əxbari dövrünün əsas alimləri**

Əxbariliyin – hədisçi və hədispərəstliyin kökünü İslamın ilk əsrlərində mövcud olmuş Əhli-hədis məktəbinə aid etmək olar. Əhli-sünnədə Peyğəmbər və səhabələrin, Şiəlikdə də Peyğəmbər və imamların yaşadığı dövrdə, təbii olaraq, hər bir dini görüş və hökm nəql üzərində dayanır, rəvayətçilərin vasitəsilə Allah rəsuluna istinad edilirdi. O zaman Əhli-beyt imamlarının səhabələri arasında əqli metodlardan istifadə edən, daha doğrusu etiqada dair ayə və hədislərdə göstərilən əqli dəlillər üzərində işləyib onları genişləndirən, həmçinin fiqh və hüquqda ictihad edən, ayə və hədislərdən ümumi qaydalar çıxarıb ayrı-ayrı yerlərdə tətbiq edənlər vardı. Lakin şiələr əsasən, Əhli-beyt imamlarına müraciət edir və bununla işlərini asanlaşdırırdılar. Onların yaşadığı dövrdən uzaqlaşdıqca isə həm saxta hədislərin çoxalması, həm də hökmü Quran və sünnədə açıq göstərilməyən məsələlərin qarşıya çıxması etiqadda kəlam elminin, hüquq və şəriətdə isə fiqh və üsul elmlərinin, həmçinin ictihad amilinin formalaşmasına səbəb oldu. Qədim kəlamda ağıldan müstəqil bilik mənbəyi kimi istifadə etməsələr də, Quran və sünnə dəlillərinin əqli şərt və nəticələri qəbul olunurdu. İctihad zamanı da Quran və sünnədən əlavə, get-gedə ağıl və icma dəlillərinə müraciət etməyə başladılar. Bu əsnada kəlam və ictihadı rədd edən, bəzən isə hətta bidət sayan Əhli-hədis məktəbi formalaşdı. Qumi, Kuleyni və Səduq Şiə Əhli-hədisinin görkəmli nümayəndələri sayılırlar.

Qeyd etdiyimiz kimi, hələ imamların dövründə bəlli şərtlər daxilində əqli dəlillərə müraciət edən və imamların göstərişi ilə şəriət hökmlərində ictihad edib fətva verən səhabələr vardı. Qeyb dövründə, xüsusən Şeyx Müfiddən sonra məhz bu xətt Şiəlikdə ana xətt kimi davam etdi, Müfid və şagirdləri həm mütəkəllim (kəlam alimi), həm də müctəhid olaraq, Əhli-hədis tərəfdarlarını bir növ təcrid etmiş oldular. Lakin buna baxmayaraq, etiqadda kəlam elmini, şəriətdə də ictihad və təqlidi qəbul etməyən alimlər hər zaman olmuşdur.

Səfəvilər dövləti (1501-1722) qurulduqdan sonra Şiə elm hövzələrində kəlam, fiqh, üsul və ictihad, eləcə də fəlsəfə çox güclü

inkişaf etməyə başladı, Mir Damad (1543-1631), Mir Fendereski (1562-1640), Molla Sədra (1571-1640) kimi filosoflar meydana çıxdı. Sonralar isə əsasən müsəlman müctəhid və filosoflara, ilk baxışdan dini mətnlərə zidd olan bəzi fiqhi və fəlsəfi fikirlərə qarşı reaksiya Əxbarilik cərəyanının yaranmasına səbəb oldu. Bu cərəyanın banisi olan Məhəmməd Əmin Əstərabadi (vəfatı: 1627) özünü Kuleyni və Səduq kimi qədim Əhli-hədisin davamçısı saysa da, bir çox məsələlərdə onlardan fərqlənib daha ifratçı yol tutdu. Əslində, həmin dövrdə Hürr Amili, Feyz Kaşani kimi Əhli-hədis nümayəndələri vardı və onlar Əstərabadinin fikirləri ilə razılaşmırdılar. Əbəs deyil ki, onun yaratdığı cərəyan da Əhli-hədis kimi deyil, Əxbarilik adlı yeni bir kimliklə tanınmışdır.

Əxbariliyi müəyyən mənada Şiə sələfiliyi də adlandırmaq olar. Onlar da sələfilər kimi ağlın rolunu inkar edir, nəqli dəlilləri əqli dəlillərdən üstün tutur, hədisləri dəqiq araşdırmadan müqəddəsləşdirir, qədimkilərin dini mətnlərə dair dərkini əsas götürürdülər. Odur ki, metod baxımından əxbarilər vəhhabilərə daha yaxın sayılır.

Əxbarilər arasında fərqli görüşlər, ifratçı və mötədil alimlər olsa da, aşağıdakı fikirləri onların əsas səciyyələri hesab etmək olar: ictihad, təqlid və fəlsəfənin haram sayılması, din və şəriətin qaynağı kimi yalnız məsumların sünnəsinin qəbul olunması, dörd hədis kitabının başdan-ayağa səhih bilinməsi və sair. Yeri gəlmişkən deyək ki, Əstərabadi dinin zəruri məsələləri xaricində hər hansı hökm və məsələdə yalnız hədislərə müraciət etməyi lazım bilir və bunu doqquz dəlillə əsaslandırmağa çalışırdı. (Əstərabadi M. “Əl-Fəvaid əl-mədəniyyə”, 254-256)

Əksər əxbarilərə görə, hədislərin səhih sayılmasında müxtəlif meyarlar vardır ki, onlardan biri də Şiənin dörd hədis kitabında qeyd olunmasıdır. Tarix boyu əksər Əhli-sünnə alimləri də Buxari və Müslimin hədis kitablarının bütün hədislərini səhih saymışlar və sayırlar. Lakin heç bir hədis mənbəyinin sığortalanmadığı saxta və

uydurma rəvayətləri nəzərə alsaq, bu düşüncənin nə qədər təhlükəli olduğu kimsədə şübhə doğurmaz.

17-19-cu əsrlərdə Şiə dünyasında əsas tribunaları, elm hövzələrini ələ keçirmiş əxbarilər təkcə dörd hədis kitabında olanlarla da kifayətlənməyib, az qala bütün hədislərə müqəddəs gözlə baxır, onları Qurandan önə keçirirdilər. Onlar Quran ayələrindən dərk olunan mənaları etibarsız sayır, yalnız məsumların dərk etdiklərini mötəbər bildikləri üçün həmişə hədislərə müraciət edirdilər.

Uyğun dövrdə əxbarilərlə digər şiələr – üsuli, mütəkəllim və filosoflar arasında çəkişmələr, dartışmalar olmuşdur. Tanınmış Şiə filosofu Molla Sədra əxbariləri ağıldan kəm (Sədra M. "Əl-Hikmə əl-mütəaliyə", 9/202), fəqih Kaşif əl-ğita isə İmamiyyə və Cəfəri firqəsindən xaric hesab edirdi. (Kaşif əl-ğita C. "Əl-Həqq əl-mubin". www.ekhbarion.com) Əxbarilər ağlı bir kənara qoyub nəqlə o qədər sadəlövhcəsinə bağlanmışdılar ki, Nemətullah Cəzairi kimi bir Əxbari alimi bəzi hədislərin rəvayət sənədini iki ustadından və min ildən artıq ömür sürmüş bir məxluqdan - güman ki, cindən ibarət qısa yolla imamlara çatdırırmış. (Cəzairi N. "Əl-Ənvar ən-nömaniyyə", 2/6-7) Əxbari və üsulilər arasında bəzən elə gərginlik yaranırdı ki, bir-birinə qarşı xoşagəlməz ifadələr işlədir, bəzən hətta təkfir də edirdilər. Nəcəf və Kərbəlanın əxbari alimləri üsul elminin tədris və təhsilini haram əməl sayır, əlləri nəcis olmasın deyə uyğun kitabları dəsmalla götürürdülər. Əsas Şiə alimlərindən olmuş və Əxbariliyin süqutunu başlatmış Vəhid Bəhbəhani isə Əxbari alimi Şeyx Yusif Bəhraninin namaz və dərslərində iştirakı qadağan etmişdi.

Ustad Şəhid Mütəhhəri bu cərəyan haqda yazır:

"Əxbarilik davam etdiyi iki-üç əsr ərzində müsəlmanların böyük bir hissəsini öz təsiri altına salmış və minlərlə günahsız insanın qanının tökülməsinə, saysız-hesabsız müharibələrin baş verməsinə səbəb olmuşdur.

...Bəs Quran? Hədislərin mötəbərliyini sübuta yetirmək üçün onu necə ortadan götürməli idilər? Axı onun Allah kəlamı olmadığını

deyə bilmirdilər. Əxbarilər belə bir məntiqə əl atdılar: «Quran hər şeydən uca olduğu üçün adi insanlar onu başa düşməyə qadir deyillər. Onu dərk edə biləcək şəxs varsa, o da məsum imamlardır».

Ümumiyyətlə, onlar belə bir fikirdədirlər ki, Quranın müraciət etdiyi şəxslər əsla bizlər (müsəlmanlar) deyilik. Beləliklə, Quranı da etibardan salaraq, yalnız hədis və rəvayətlərə müraciət etməyi zəruri hesab etmişlər... (Fatihə surəsinin sonuncu) ayəsini onlardan bəziləri öz saxta hədislərinə istinad edərək belə oxumuşlar: «Siratə mən ənəmtə ələyhim ğayril məğzubi ələyhim və ğayriz-zallin». Beləliklə, saxta və qeyri-mötəbər hədislərə istinad edərək, Quranın bir çox ayə və kəlmələrini dəyişib bir qədər fərqli oxumuşlar.

Əxbarilikdən ibarət belə bir qorxulu tərz-təfəkkür İslam dünyasına ağır zərbə vurmuşdur. Təəssüflər olsun ki, onun ağrı-acısı hələ də qalmaqdadır". (Mütəhhəri M. İslam və zamanın tələbləri, c. 1, fəsil: 9. www.kitab.nur-az.com)

Bütün bunlara əsasən, deyirik ki, Əxbarilik əsas Şiəlikdən fərqli, bəzi məsələlərdə ona zidd bir cərəyandır, xüsusi firqə və məzhəb olmasa da, təkcə metodlarda deyil, həm etiqadda, həm də şəriətdə ciddi fərqlərə malikdir. Xüsusən ifratçı əxbarilər əsas Şiəliyi təmsil edə bilməzlər, onların hansısa hədisi səhih saymaları, Qurana dair hansı görüşlərə malik olmaları Şiəliyə deyil, onun Əxbari qoluna aid edilməlidir. Əslində, əxbari olan birisinin Quranın təhrif edilmədiyini söyləməsi təəccüb doğurandır. Eyni zamanda, Quranın bəzi sözlərinin müəyyən ayələrdən çıxarılmasını da bütün Əxbari alimləri deyil, onların bir qismi söyləyib.

Vəhhabi sələfilərinin təhrif düşüncəsində ittiham etdiyi alimlər – Məhəmməd Saleh Mazandarani (vəfatı: 1675), Əllamə Məclisi (1616-1698), Nemətullah Cəzairi (1640-1701), Əbülhəsən Amili (vəfatı: 1726), Yusif Bəhrani (1695-1772), Hüseyn Nuri Təbrisi (1838-1902) və Sultan Adnan Bəhrani Şiəliyin Əxbari qoluna, Əhməd Əhsai (1753-1826) və Kərimxan Kermani (1809-1870) Şeyxiyyə firqəsinə, Məhəmməd Günabadi (1835-1909) isə hətta Nemətullahi sufiliyinə mənsub

olmuşlar. Şiə alimləri bütün bu firqələrə qarşı mübarizə aparmış, kitablar yazmışlar. Bu gün isə vəhhabilər çox absurd olaraq, belə firqələrin fikirlərinə görə Əhli-beyt məzhəbini ittiham edirlər.

Göründüyü kimi, Quranın təhrif olunduğunu, vəhhabilərin iddia etdiyi kimi, heç də ən böyük Şiə alimləri deyil, Şiəliyin əsasən Əxbari qolunun bir qisim alimləri söyləmişlər. Bu düşüncəni əxbarilərlə eyni dövrdə yaşamış və onlardan təsirlənmiş bir neçə qeyri-əxbarinin bölüşməsi də - əgər həqiqətdirsə - Şiə icmasına ciddi xələl gətirmir.

Sonda xatırlatmaq istəyirik ki, Əxbariliyin banisi Əstərabadi və onun bəzi əlaqələri barədə şübhələr mövcud olsa da, heç də bütün Əxbari alimlərini xəyanətdə günahlandırmaq olmaz. Onların arasında ixlasla xidmət etməyə çalışmış, lakin yanlış dini əsaslara və səhv elmi önfərziyyələrə uyaraq bəzi əsaslı məsələlərdə əsl Əhli-beyt yolundan yayınmış alimlər az olmamışdır. Xüsusən qədim İslam irsinin və tarixi əhəmiyyətli kitabların günümüzədək gəlib çatmasında bir çox əxbari alimlərinin rolu danılmazdır.

İndi isə sözügedən dövrdə yaşamış bir qisim Şiə aliminin fikirləri ilə tanış olaq:

**4. 2. 1. Nurullah Şüştəri (1542-1610)**

Üçüncü Şəhid ləqəbli Qazi Nurullah Şüştəri yazır:

"İmamiyyə şiələrinin böyük əksəriyyətinin Quranın dəyişildiyini düşündüyünü söyləyirlər. Halbuki bunu çox kiçik bir qrup deyib və şiələr arasında onlara etina olunmur. (Şüştəri N. "Məsaib ən-nəvasib", 121)

**4. 2. 2. Şeyx Bəhai (1547-1621)**

Bir çox dini və dünyəvi elmlərə mükəmməl yiyələnmiş böyük alim Bəhaəddin Amili deyir: "Doğrusu budur ki, Qurani-kərim artırma və azaltmadan qorunmuşdur. Allah-Taalanın "Şübhəsiz ki,

Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!" (Hicr/9) sözü bunu sübut edir". (Bəlaği, 1/26)

**4. 2. 3. Feyz Kaşani (1599-1680)**

Bəzi sələfilər tərəfindən sözləri təhrif olunan, iftiraya məruz qalan daha bir Şiə alimi Molla Möhsün Feyz Kaşanidir. Onlar ya qərəzli olduqlarından, ya da bir çox alimlərin elmi yazı üslubunu bilmədiklərindən bu alimə böhtan atır, sözlərini kontekstdən çıxararaq təhrif düşüncəsində günahlandırırlar. (Bax: Əs-Seyf, 14-15) Əslində isə bu üslubda hər bir iddia və arqumentə qarşı müxtəlif iradlar tutulur, sonra onlara cavab verilir, daha sonra həmin cavablara irad bildirilir və sair. Odur ki, hər hansı iradı və ya cavabı görən kimi müəllifin mövqeyi kimi qəbul etmək olmaz. Bu üslubda həm tələsməmək, mövzunu ən sonuna qədər izləmək, həm də müəllifin istifadə etdiyi sözlərə, bütün dəlilə, yoxsa onun bir hissəsinə irad bildirməsinə dəqiq fikir vermək lazımdır.

Təəssüf ki, həm Sələfi, həm də Şiə alimləri Feyzin sözləri üzərində "qayçı əməliyyatı" apararaq yalnız müəyyən hissələrini qeyd etmişlər. Bizsə kiçik ixtisarla, lakin ardıcıllığı və mühüm məqamları qorumaq şərtilə onun fikrini tam şəkildə təqdim edirik:

Müəllif Quranın "təhrifinə", daha doğrusu, qiraət fərqlərinə, bəzi təfsirlərin çıxarılmasına və düzülüş fərqlərinə dair hədislərə işarə vuraraq yazır: "BÜTÜN BU HƏDİSLƏRƏ GÖRƏ, qarşımızdakı Quran onun hamısı deyil; dəyişdirilmiş, bəzi hissələri çıxarılmış və tərtibatı pozulmuşdur".

Bunun ardınca Əli ibn İbrahim Quminin təfsirindən uyğun sitatlar gətirir və deyir: "Bunların hamısının nöqsanı var. O da budur ki, belə olduqda Quranın heç bir sözünə inam qalmaz, hər bir ayədə dəyişilmə və təhrif ehtimalı olar, Quran əsla höccət (əsas, meyar) ola bilməz, həm özü, həm də ona tabe olmaq, sarılmaq əmri faydasız, əbəs olar. Halbuki Allah-Taala buyurub: "O, şübhəsiz ki, yenilməz (qiymətli) bir kitabdır. Nə öncə, nə də sonra batil ona yol tapa bilməz".

(Fussilət/41-42) Həmçinin buyurub: “Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!” (Hicr/9) Belə olduqda o necə təhrif edilə, dəyişdirilə bilər?! Həmçinin Peyğəmbərdən və imamlardan nəql olunan müstəfiz hədislərə görə, rəvayətləri Allahın kitabı ilə ölçmək, uyğun olduqda doğru bilmək, zidd olduqda isə yalanlamaq lazımdır. Amma əlimizdəki Quran təhrif olunmuşdursa, bunun xeyri nədir?! Bundan əlavə, təhrif hədisləri Allahın kitabına zidd olduğu və onu təkzib etdiyi üçün ya mütləq rədd edilməli, ya da münasib şəkildə açıqlanmalıdır”.

Sonra müəllif öz cavabını mikroskop altında incələməyə başlayır və iki versiya irəli sürür: “Bu irada cavab kimi zehnə belə bir fikir gəlir ki, deyilsin: ƏGƏR BU HƏDİSLƏR DOĞRU OLSA, onda məqsədə çox da xələl gətirməyən dəyişikliyin baş verdiyini, məsələn, “Əli”, “ali-Məhəmməd” sözlərinin və münafiqlərin adlarının çıxarıldığını söyləmək olar”. İkinci versiyada isə özünün Quranın təhrif olunmadığına dair yuxarıdakı dəlillərini bir daha təsdiqləyir və sözügedən rəvayətlərə - səhih olsalar belə - çözüm tapır: “Həmçinin belə demək mümkündür ki, Qurandan çıxarılanlar onun tərkib hissəsi deyil, əlavə təfsir və izahlar olmuşdur. Quranın dəyişdirilməsi də mənəvi baxımdandır: yəni təfsir və təvilini təhrif etmişlər. İmamların “belə nazil olub” sözü də ayənin məqsədi barədədir, uyğun əlavələrlə nazil olub həmin əlavələrin sonradan çıxarılması demək deyil. İmam Baqirin Səd əl-Xeyrə yazdığı məktub, həmçinin Əhli-sünnənin İmam Əlinin müshəfi haqda yazdıqları da bu versiyanı sübut edir”. Feyz Kaşani bu fikirlərin özünün son rəyi olduğunu bildirmək üçün dərhal yazır: “Bu, mənim iradlara bildiyim cavabdır, əsl həqiqəti isə Allah bilir”. (Feyz Kaşani. “Təfsir əs-safi”, 1/49-52)

Bütün bu yazılanlardan sonra kimsə Feyzi Quran təhrifi düşüncəsində ittiham edə bilərmi?! Göründüyü kimi, o, bunun imkansız olduğuna şübhə etmir, sadəcə, bəlli hədislərin düzgün olduğu təqdirdə məsələni həll etməyə, heç bir iradla nəticələnməyəcək qüsursuz cavab axtarmağa çalışır. O, yuxarıdakı qeydlərindən sonra

Şiə alimlərinin mövzuya dair fikir və dəlillərini araşdırmağa başlayır, bu zaman da hansı dəlilə iradı olsa, dərhal bildirir. Lakin onların arasında ən azı, Quranın təhrif olunmayacağını qətiyyətlə bildirən ayələr, bunun baş vermədiyini göstərən hədislər və təhrifi imkansız edən möcüzəvi imicdən ibarət dəlillərə nəinki irad bildirmir, hətta özü onlara istinad edib, müxalif fikirləri cavablayır.

Bütün bunlardan sonra bir insanın günahına girmək, ona şər atmaq və bunun ardınca küfrünə fərman verib lənətləmək müsəlmanlıqdandırmı?! Elə isə Məhəmməd Malullahın qeydlərinə nəzər salın (Malullah, 84-85) və Feyzin fikirləri üzərində apardığı kobud "qayçı" əməliyyatına, hətta "belə olduqda", "bu, mənim iradlara bildiyim cavabdır" hissələrini də hansı şəkildə kontekstdən çıxarıb, hansı yerlərə caladığına özünüz ad verin.

Feyz Kaşani həmçinin "Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!" (Hicr/9) ayəsinin təfsirində açıq şəkildə bildirir: "Təhrif, dəyişiklik, artma və azalmadan (qoruyub saxlayacağıq)". (Feyz Kaşani M. "Əl-Əsfa fi təfsir əl-Quran", 1/626)

### 4. 2. 4. Hürr Amili (1624-1693)

Əsas hədis kitablarını toplayaraq "Vəsail əş-Şiə" ensiklopediyasını ərsəyə gətirmiş Şeyx Hürr Amili dövrünün bəzi əxbarilərinin Qurana şübhə ilə yanaşmasına qarşı çıxaraq, onun əsrlərlə mütəvatir şəkildə nəql olunduğuna dair "Təvatür əl-Quran" kitabını yazmışdır. Ad və yazılma məqsədindən göründüyü kimi, bu kitab mövcud Quranın əxbarilər arasında etibarını bərpa etməkdən ötrü qələmə alınmışdır. Buna uyğun olaraq, müəllif onun azalmadan qorunduğunu isbatlamağa cəhd etməsə də, sözlərindən onun bu fikirdə olduğunu başa düşmək olur. O, Quranın Peyğəmbərin öz dövründə kitab halına salındığını və tarix boyu həmişə mütəvatir şəkildə nəql olunduğunu qeyd etməklə yanaşı, əl-İhticac kitabının Quranın azalmasına dəlalət edən bəzi hədisləri barədə yazır: "Bu və

digər oxşar hədislərdən görünür ki, imamlar Quranın hamısının haqq və doğru olduğuna, əlavə və dəyişikliklərdən qorunduğuna hökm etmişlər. Onlardan başa düşülən azalmaya gəldikdə isə, azalanların ayələrlə birgə nazil olmuş təvil və açıqlamalar, Qurandan xaric vəhy, mənsux ayələr və s. olduğu ehtimal olunur”. (Hürr Amili M. “Təvatür əl-Quran”, 68-69)

**4. 2. 6. Nurəddin Kaşani (vəfatı: 1703)**

Nurəddin Kaşani ləqəbli əxbari alim Məhəmməd ibn Mürtəza təfsir kitabında “Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!” (Hicr/9) ayəsinin təfsirində yazır ki, məqsəd təhrif, dəyişiklik, artma və azalmadan qorunmasıdır. (Kaşani M. “Təfsir əl-muin”, 2/650)

**4. 2. 7. Məhəmməd Qumi Məşhədi (vəfatı: 1713-dən sonra)**

Əxbari dövrünün başqa bir alimi Məhəmməd ibn Məhəmmədrza Qumi Məşhədi deyir: “Sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!” (Hicr/9) ayəsində məqsəd təhrif, artma və azalmadan qorumaqdır və bu zəmanət ona hər hansı xələlin yol tapmasını inkar edir”. (Qumi Məşhədi M. “Kənz əd-dəqaiq”, 7/104)

**4. 2. 8. Kaşif əl-ğita (1743-1812)**

Təhrif düşüncəsinə qarşı çıxan daha bir Şiə alimi Şeyx Cəfər Kaşif əl-ğitadır. Əxbariləri qəribə hökmlərdə və xoşagəlməz fikirlərdə ittiham edən bu alim deyir: “(Bu fikirlərdən biri) izahının olduğu və ya tərkinin vacibliyi şübhə doğurmayan bəzi rəvayətlərə istinad edib Quranın azaldığını söyləmələridir... Çox təəccüblüdür ki, onlar bu 1200 ildə hədislərin şifahi və yazılı şəkildə qorunduğunu düşünür, amma Quranın azaldığını bildirirlər”. (Kaşif əl-ğita. “Əl-Həqq əl-mubin”. www.ekhbarion.com)

O özünün məşhur kitabında müsəmanların Qurana bir hərfin belə artırılmadığına, həmçinin Peyğəmbərdən sonra heç bir hissəsinin

çıxarılmadığına dair yekdil rəydə olduğunu qeyd edir, kitab, sünnə, icma dəlilləri ilə və tarixi faktlarla fikrini əsaslandıraraq yazır: "Quran Allah tərəfindən, azalmadan da qorunmuşdur. Quranın açıq-aşkar ayələri və bütün zamanlarda bütün din alimlərinin icması bunu sübut edir. Bəzi tək-tük istisnalar isə mötəbər deyil". (Kaşif əl-ğita C. "Kəşf əl-ğita", 2/299)

### 4. 3. Əxbarilikdən sonrakı əsas Şiə alimləri

#### 4. 3. 1. Seyid Möhsün Əmin (1867-1952)

Livanlı Şiə alimi Möhsün Əmin, Şərif Mürtəzadan başqa bütün şiələri Quranın təhrif olunması, həm artırılması, həm də azaldılması düşüncəsində ittiham edən İbn Həzmə (994-1064) cavab olaraq yazır: "Qədim və müasir İmamiyyə alimlərinin nəinki hamısı, ümumiyyətlə, heç biri Qurana hər hansı əlavələrin edildiyini söyləməyib və buna icma etmişlər. Sözü sayılan bütün tədqiqatçı alimlər Quranın azalmadığına da dair yekdil rəyə sahibdirlər. Onlara bunun əksini aid edən isə Allaha və rəsuluna hörmətsizlik edən yalançı və iftiraçıdır". (Möhsün Əmin. "Əyan əş-Şiə", 1/41) Başqa bir yerdə isə əlavə edir: "Quranın azaldığını təkcə şiələrdən deyil, həm də sünnilərdən olan çox kiçik bir qrup söyləmişdir, ondan öncə isə hər iki firqə onun azalmadığına icma etmişlər". (Yenə orada, 44)

#### 4. 3. 2. Məhəmmədhüseyn Kaşif əl-ğita (1876-1954)

Kaşif əl-ğita ailəsinin nümayəndələrindən olmuş bu alim yazır: "İmamiyyə şiə etiqadına görə, müsəlmanların əlində olan kitab Allahın nazil etdiyinin özüdür; nə azaldılıb, nə artırılıb, nə də təhrif olunub. Şiənin icma etdiyi budur. Onlardan və ya başqa firqələrdən kimsə onun azaldığını və ya təhrif edildiyini düşünsə, səhv etmişdir. Təhrifə dəlalət edən Şiə və ya qeyri-şiə hədisləri isə zəifdir. Üstəlik, (səhih olsa belə) vahid hədislər elm və əməl üçün əsas sayılmır". (Kaşif əl-ğita M. "Əsl əş-Şiə və üsuluha", 220)

### 4. 3. 3. Əllamə Əmini (1902-1970)

Təbrizli alim Əllamə Əmini də Şərif Mürtəzadan başqa bütün şiələri Quranın təhrif olunması, həm artırılması, həm də azaldılması düşüncəsində ittiham edən İbn Həzmə cavab olaraq yazırdı: “Kaş hörmətsizlik edən bu adam iftirasına dair etimadlı Şiə kitablarından birinə, şiələr arasında çəkisi olan bir alimə, əksəriyyət tərəfindən tanınmasa da, qabaqcıl olan tələbələrindən, yaxud cahillərindən, sadə kəndlilərindən və ya ağzına gələni danışan boşboğazlarından birinin sözünə işarə vuraydı. Əgər oxucu araşdırsa, İmamiyyənin erkən çağında bu iftiranın inkarından başqa bir şey tapmaz... İmamiyyə başda olmaqla bütün Şiə firqələri mövcud Quranın Allahın hər bir şəkk-şübhədən uzaq kitabının özü olduğuna dair yekdil fikirdədirlər. Hansısa şiədən “təhrif” sözü eşidilsə də, onun məqsədi yanlış təvil və açıqlamadır, artırılması, azaldılması və ya hərflərinin dəyişdirilməsi deyil”. (Əmini Ə. Əl-Qədir, 3/101)

Əmininin bu iddiası bir qədər böyük görünə bilər. Osman əl-Xəmis onun fikirlərini qeyd etdikdən sonra yazır: “Şübhə yoxdur ki, yuxarıdakılara (Şiə alimlərinin sözlərinə) əsasən, İbn Həzm doğru, Əmini isə yalan deyir”. (Əl-Xəmis O. “Şiə və Quran”. www.almanhaj.net)

Cənab Xəmisə xatırlatmaq istəyirik ki, Əmini bu sözləri İbn Həzmə cavab kimi söylədiyi üçün onun məqsədi İbn Həzmdən qabaqkı şiələr ola bilər. Və siz həmin dövrün bir alimindən – təbii ki, dəyişdirilmiş kitablardan deyil, müəllifə istinadı şübhə doğurmayan əsl Şiə kitablarından Quranın təhrif olunduğuna dair bir cümlə göstərməmisiniz. İbn Həzmin Şiə alimlərindən Şeyx Tusi ilə təxminən həmyaşıd olduğunu nəzərə alsaq, ondan qabaq yalnız Mürtəza deyil, Səduq, Müfid və Tusinin özü də bunu açıq-aşkar rədd etmişlər və siz bunu yaxşı bilirsiniz. Belə olan halda, İbn Həzm necə doğru söyləyə bilər?!

### 4. 3. 4. Əllamə Təbatəbai (1903-1981)

Əllamə Təbatəbai özünün 20 cildli əl-Mizan təfsirində "Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!" (Hicr/9) ayəsini təfsir edərkən Quranın təhrif edilmədiyini, artırılıb-azaldılmadığını Quran ayələri və hədislərdən əlavə, əqli dəlil və tarixi faktlarla isbat etmiş və uyğun şübhələri cavablandırmışdır. (Təbatəbai M. "Təfsir əl-mizan", 12/104-132)

### 4. 3. 5. İmam Xomeyni (1902-1989)

İmam Ruhullah Xomeyni Nuri Təbrisiyə ciddi etirazını bildirərək yazırdı: "Quran əsla təhrif olunmamışdır. Əhli-sünnə və Şiə firqələrinin tədqiqatçı alimlərinin fikri də belədir... Fəsl əl-xitab" kitabının müəllifinin xəyalları isə nə elm və nə əməl baxımından yararlıdır. Bu kitab Şiə alimlərinin üz çevirdiyi və qədim alimlərimizin qəbul etmədiyi zəif rəvayətlərə istinaddan başqa bir şey deyil. Onun Müstədrək kimi hədis kitablarının vəziyyəti bəllidir, əksəri yumora bənzəyən qəribə nağıl və hekayələrlə dolmuş digər kitabları haqda isə danışmağa dəyməz. O mərhum saleh və zəhmətkeş insan olmuş, lakin faydalı sözlərdən daha çox, sağlam ağıl və düşüncənin qəbul etmədiyi zəif və qəribə hədisləri toplamağa həvəs göstərmişdir. Onunla eyni dövrdə yaşamış ayıq insanlara təəccüb edirəm ki, necə diqqətsizlik etdilər və nəticədə göyləri ağladan, az qala yeri parça-parça edən hadisə baş verdi (və o, Quranın təhrif edildiyinə dair kitab yazdı)". İmam Xomeyni sonra bu iddianın əleyhinə bəzi dəlillərini qeyd etmişdir. (Xomeyni R. "Ənvar əl-hidayə", 1/243-245)

### 4. 3. 6. Ayətullah Xoi (1899-1992)

Təkcə öz dövrünün deyil, həm də bütün Şiə tarixinin ən böyük din alimlərindən olmuş azərbaycanlı müctəhid Ayətullah Xoi deyir: "Quranın təhrif olunması fikri xurafat və xəyaldır... Ağlı, insafı və dərin düşüncəsi olan heç kəs təhrif fikrinin əsassız və cəfəngiyat olmasına şübhə etməz". (Xoi, 259)

**Yekun söz**

Biz böyük qeyb dövründən – eyni zamanda Kuleyninin vəfat etdiyi hicri 329-cu ildən günümüzədək yaşamış ən əsas və tanınmış Şiə alimlərinin Quran təhrifinə dair fikirlərinə nəzər saldıq. Aydın oldu ki, təfsir kitabı sonradan dəyişdirilmiş Əli ibn İbrahim Qumini və əl-İhticac kitabının məchul müəllifini çıxmaq şərtilə burada sözü keçənlərin hamısı müqəddəs kitabımızın təhrifdən qorunduğunu bildirmiş və elmi dəlillərlə əsaslandırmışlar. Bu arada əsas Şiəliyə deyil, onun Əxbarilik və Şeyxilik qollarına, həmçinin bəzi sufi təriqətlərinə mənsub olmuş və əsasən 17-19-cu əsrlərdə yaşamış bir qrup alim isə İmamiyyə şiələrindən fərqli olaraq, Quranın təhrif olunduğunu söyləmişlər.

Əgər məhdudiyyət olmasaydı, biz Quranın təhrif edilmədiyini söyləmiş Şiə alimlərinin siyahısını artıra, Məhəmməd ibn Həsən Şeybani, Kəmaləddin Kaşifi, Məhəmməd ibn Əli Şeybani, Fətullah Kaşani, Nakuri, Fazil Tuni, Humsi, Şərif Lahici, Həsəni, Şüştəri, Əbdülali, Bəyazi, Şahşahani, Kuhkəməri, Mühəqqiq Ərdəbili, Mühəqqiq Təbrizi, Mühəqqiq Bağdadi, Şərəfüddin Amili, Məhəmməd Cavad Müğniyə, Əllamə Bəlaği, Milani, Müzəffər, Həkim, Aştiyani, Mamaqani, Bürucerdi, Məhəllati, Fəzlullah, Lənkərani və digərlərinin, həmçinin hazırda yaşayan Şiə alimlərinin də fikirlərini qeyd edə bilərdik. Əslində, Əxbari dövrünün bir qisim alimini çıxsaq, bütün Şiə alimlərinin Quranın təhrif olunmadığına dair icma etdiklərini söyləyə bilərik. Necə ki, əxbarilərdən öncə yaşamış bəzi alimlər belə bir icma iddiasında olmuşlar. Bunun əksini, yəni Şiə alimlərinin Quranın təhrif olunduğuna dair icma etdiyini söyləmək isə elmdən bəhrəsi olmayan cahillərə yaraşar; istər əxbari olsunlar, istər Əhli-beyt məzhəbinə qarşı qərəzli mövqedə olan sələfilər, istərsə də müsəlmanlar arasında parçalanma yaratmağa çalışan qərbli şərqşünaslar.

İcma olmadıqda isə heç bir məzhəb ümumilikdə ittiham olunmaz, hansısa alimlərin fikirləri yalnız özlərinin subyektiv rəyi

kimi qəbul olunar. Nümunə üçün deyək ki, Peyğəmbər və imamların məsumluğu, onların Allah tərəfindən təyin olunmaları, qiyamətdə şəfaət etmələri və sair bu kimi etiqadlara dair Şiə alimlərinin icması olduğu üçün onları ümumilikdə Şiə firqəsinə aid etmək olar.

Təhrifdə ittiham olunan Şiə alimləri haqda əsl həqiqət bundan ibarətdir. Göründüyü kimi, onların bəzisinin sözü yanlış anlaşılmış, bəzisinin sözü kontekstdən çıxarılmış, bəzisi istinadı bəlli olmayan kitablara görə ittiham olunmuş, bəzisi isə qərəzli şəkildə iftiraya məruz qalmışdır. Bu arada həqiqətən Quranın Peyğəmbərdən sonra azaldığını düşünən bir neçə nəfər də olmuşdur və onlar Şiənin əsas xəttinə deyil, əsasən Əxbari qoluna - Quranın zahirini höccət saymayıb hədisləri daha üstün tutan qrupa mənsubdurlar. Lakin hətta Əxbariliyə deyil, əsas Şiəliyə mənsub olsaydılar da, yüzlərlə böyük alim arasında bir neçə nəfərin səhvini bütün məzhəbin adına yazmaq düzgün olmazdı. Bu, xüsusi məntiqsizlik və aqressiya tələb edir ki, bunu da yalnız bəzi vəhhabilər bacarırlar.

### 4. 4. Şiə alimləri tərəfindən Nuriyə qarşı yazılan bəzi kitablar

Mühəddis Nuri özünün bədnam və uğursuz kitabını yazdıqdan sonra Nəcəf, Samirra və digər şəhərlərdə kütləvi etirazlar baş vermiş, bəzi yerlərdə matəm elan olunmuş, Şiə alimləri onu tövbəyə çağırmış, kitabın çap və nəşrini qadağan etmiş, əleyhinə təbliğat aparmışlar. Bundan əlavə, günümüzədək ona və bəlli "kəşfinə" qarşı çoxlu məqalə və kitablar yazılmış, dissertasiya və elmi işlər müdafiə olunmuş, Qurana, təfsirə və ya Şiə etiqadlarına dair təxminən bütün əsərlərdə fikirləri rədd edilmiş, əleyhinə dəlillər göstərilmişdir. Onların hamısı haqda məlumatımız olmasa da, şiələr tərəfindən məhz bu məqsədlə ərəb və fars dillərində yazılmış elmi-monoqrafik kitablardan aşağıdakıların adlarını çəkə bilərik:

"Ala ər-Rəhim fi ər-rəddi əla təhrif əl-Quran" – Əbdürrəhim Xiyabani Təbrizi

"Defa əz hərime Quran" – Məhəmmədcavad Fazil Lənkərani

“Ədəme təhrife Quran” – Həsən Tahiri Xürrəmabadi
“Əfsaneye təhrife Quran” – Əhməd Məhdəvi Fəxr
“Əl-Burhan əla ədəmi təhrif əl-Quran” – Mirzə Mehdi Bürucerdi
“Əl-Burhan əla ədəmi təhrif əl-Quran” – Mürtəza Rəzəvi
“Əl-Höccə əla Fəsl əl-xitab” – Əbdürrəhman Məhəmmədi
“Əl-Quran əl-kərim və rivayat əl-mədrəsəteyn” – Mürtəza Əsgəri
“Əl-Quran məsun min ət-təhrif” – Lütfullah Safi
“Əl-Qövl əl-fasil əla rədd müddəi ət-təhrif” – Mərəşi Nəcəfi
“Ət-Təhqiq fi nəfy ət-təhrif” – Əli Milani
“Fəsl əl-xitab fi ədəm ət-təhrif” - Həsən Həsənzadə Amuli
“Həqaiq hammə hövlə əl-Quran əl-kərim” – Cəfər Mürtəza Amili
“Hifz əl-kitab əş-şərif” – Məhəmmədhüseyn Şəhristani
“Kəşf əl-irtiyab fi ədəmi təhrif əl-kitab” – Müərrəb Tehrani
“Nəfy ət-təhrif və ət-təshif” – Məhəmmədhüseyn Cəlali
“Nəqd və bərrəsiye rivayate təhrif dər ketabe Fəsl əl-xitab” – Möhsün Bəyat.
“Nəzahəte Quran əz təhrif” – Cavadi Amuli
“Nəzahət əl-Quran min ət-təhrif” – Baqir Şərif Qürəşi
“Səlamət əl-Quran min ət-təhrif” – Əli Musa Kəbi
“Səlamət əl-Quran min ət-təhrif” – Fətullah Nəccarzadeqan
“Siyanə əl-Quran min ət-təhrif” – Kamal Heydəri
“Siyanə əl-Quran min ət-təhrif” – Məhəmmədhadi Mərifət
“Tənzih ət-tənzil” – Əlirza Xosrovani
“Ukzubə təhrif əl-Quran” – Rəsul Cəfərian
İlqar İsmayılzadə və sair.

**4. 5. Quranın təhrif edildiyini düşünən qeyri-şiə alimləri**

İndi isə Quranın təhrif olunduğunu düşünən qeyri-şiə alimlərinə - sələfilərin bəzi sələflərinə ötəri nəzər salaq. Hicrətin 21-ci ilində dünyaya gəlmiş, qiraət və təfsir elmlərini İbn Abbasdan öyrənmiş,

Aişə, Əbu Hüreyrə və Abdullah ibn Ömər kimi səhabələrdən hədis nəql etmiş görkəmli tabei Mücahid ibn Cəbrin (642-722) belə söylədiyi qeyd olunmuşdur: "Əhzab surəsi Bəqərə qədər və ya ondan da uzun olmuş, Müseylimə ilə döyüşdə (Quran hafizlərinin şəhadəti səbəbindən) çoxlu ayələr əldən çıxmışdır". (İbn Əbdülbirr Y. Ət-Təmhid, 4/275) O həmçinin Ali-İmran surəsinin 81-ci ayəsinin katiblərin səhvi ucbatından səhv yazıldığını söyləyir, "nəbiyyin" sözünün yerinə "əlləzinə utul-kitab" oxunmasını düzgün sayırmış. (Mücahid ibn Cəbr. Təfsir, 254; Təbəri M. Təfsir, 6/553-554) Bir daha xatırladaq ki, o, ayənin mövcud Qurandakı formasını fərqli və hətta zəif bir qiraət deyil, yazanların səhvi hesab edir və bununla Allah kəlamının səhvən dəyişdirildiyini düşünürmüş. Təbəri başqa bir alim olan Rəbi ibn Ənəsin (vəfatı: 757) sözügedən ayəni Mücahidin dediyi tərzdə öyrətdiyini də qeyd etmişdir. (Təbəri. Təfsir, 6/554)

Əməvi xilafətinə yaxın alimlərdən olmuş İbn Şihab Zöhri (671-741) deyir: "Bizə məlumat çatıb ki, çoxlu Quran ayələri nazil olmuşdu, lakin onları bilənlər Yəmamədə öldürüldülər. Onlardan sonra da həmin hissələr nə bilindi, nə də yazıldı". (İbn Əbu Davud, 99) Süfyan Sauri (716-778) isə yalançı Müseyliməyə qarşı Yəmamə döyüşündə şəhid olmuş yüzlərlə Quran hafizini xatırlayaraq deyirmiş ki, bununla Quranın bəzi hissələri itmişdir. (Sənani Ə. Əl-Müsənnəf, 7/329)

Bütün bu fikirlər Peyğəmbərdən sonra Quranın bəzi hissələrinin əldən çıxdığını və mövcud Quranda yer almadığını göstərir. Çünki Müseylimə Kəzzaba qarşı döyüş və orada yüzlərlə Quran hafizinin şəhidliyi Xəlifə Əbu Bəkrin dövrünə aiddir.

Quranın təhrif olunduğunu düşünən qeyri-şiə alimlərinə misal olaraq, məşhur əs-Sünən kitabının müəllifi Əbu Davudun oğlu Abdullah ibn Əbu Davudun da adını çəkmək olar. O özünün əl-Məsahif kitabında "Həccac ibn Yusifin Qurana yazdıqları" və "Həccacın Osman müshəfinə etdiyi dəyişikliklər" kimi fəsillər ayırmışdır.

Hicrətin ilk əsrlərində yaşamış Əhli-sünnə alimi İbn Şənbuz (vəfatı: 940) Quranın təhrif olunduğunu söyləyir və onu fərqli şəkildə oxuyurmuş. (Xətib Bağdadi Ə. "Tarix Bağdad", 1/296; İbn Xəllikan Ə. "Vəfəyat əl-əyan", 4/299-300; Zəhəbi M. "Tarix əl-İslam", 24/28) Sufi məsləkli olsa da, ən məşhur sünni alimlərindən olmuş İbn Ərəbi çoxlu ayələrin Osman müshəfində yer almadığını təəssüflə və açıq şəkildə söyləmişdir. (İbn Ərəbi M. "Əl-Futuhat əl-məkkiyyə", 2/447) Onun sözlərindən iksir mislində olanları seçib toplamağa çalışmış və qətiyyətlə təsdiqləmiş başqa bir qeyri-şiə alimi Şərani isə yazırdı: "Əgər zəif qəlblərdə şübhə yaranmasaydı və hikmət ona layiq olmayanlara aşkarlanmasaydı, Osmanın topladığı Quranda yer almayan ayələrin hamısını açıqlayardım". (Şərani Ə. "Əl-Kibrit əl-əhmər", 285)

Sələfi etiqadlı Alusi təfsirində yazır ki, Osmanın xilafəti zamanı qiraətlər toplananda Zeyd ibn Sabit Əhzab surəsinin 23-cü ayəsini Xüzeymə ibn Sabitdən tapıb Qurana əlavə etmişdir, lakin belə kiçik əlavələr ciddi dəyişiklik sayılmır. (Alusi, 1/24) Bu isə ən yaxşı halda o deməkdir ki, Osmana qədər müsəlmanların əlində olan Quran tam deyilmiş və üstəlik, Quranın bəzi ayələri mütəvatir şəkildə deyil, vahid sənədlə bizə çatmışdır.

Və nəhayət, yenə sünni alimlərindən olmuş İbn Xətib Misri Quranın təhrif olunması barədə əl-Furqan kitabını yazmışdır. "Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu qoruyub saxlayacağıq!" (Hicr/9) ayəsini Quranın sözlərinə deyil, məfhum və məzmununa aid edən İbn Xətib öz kitabında Həccac ibn Yusifin Quranın 12 yerində dəyişiklik etdiyini, bir ayədə işlənmiş sözü başqa bir ayədə işlənmiş sözlə əvəzlədiyini yazmışdır. (İbn Xətib M. "Əl-Furqan", 50-52) Səhabələrin Quran ayələrini fərqli şəkildə oxumalarına dair misallara da bu kitabda geniş yer verilmişdir. (Yenə orada, 106-111)

Quranın təhrif olunduğunu düşünmüş, söyləmiş və ya təsdiq etmiş qeyri-şiə alimlərinin siyahısını uzatmaq da olar. Üstəlik, Şiə

hədis kitablarının müəlliflərini ittiham edən məntiqlə yanaşsaq, Buxarini (810-870), Müslimi (815-875), sünən və müsnəd müəlliflərinin hamısını da buna əlavə edə bilərik. Lakin biz hansısa alimlərə, icma edilməyən, yekdilliklə qəbul olunmayan hansısa fikirlərə görə heç bir firqəni ittiham etmirik. Uyğun firqə alimlərinin böyük əksəriyyəti – oxunuşun nəsxinə dair fikirlərində yanlışa yol versələr də - belə alimlərlə razılaşmadıqlarını açıq şəkildə bildirmişlər. Misirdə əl-Furqan kitabı yazıldıqdan dərhal sonra öz məzhəbdaşları müəllifə sərt etirazlarını bildirmiş, sözügedən kitab yığışdırılıb məhv edilmiş və bu fikrə qarşı çoxlu əsərlər qələmə alınmışdır.

Əl-Əzhər alimlərindən olmuş Məhəmməd Mədəni şiələri təhrif düşüncəsində ittiham edənləri qınayaraq yazırdı: "Bir misirli 1948-ci ildə əl-Furqan adlı kitab yazıb Əhli-sünnə mənbələrində yer almış çoxlu saxta təhrif hədislərini qeyd etmişdi. Sonra həmin kitablar əl-Əzhərin tələbi ilə dövlət tərəfindən müsadirə olundu. İndi demək olarmı Əhli-sünnə Quranın müqəddəsliyini inkar edir və ya onun azaldığını düşünür?!" (Mədəni M. "Rəccə əl-bəs", 382-383)

## BEŞİNCİ FƏSİL: QURAN TƏHRİFİ VƏ TƏKFİR AMİLİ

Vəhhabi alimlərinin növbəti iddiası budur ki, Nuri kafir və mürtəd elan edilib qətlə yetirilmədiyinə görə, digər Şiə alimləri də onu təsdiqləmiş sayılırlar. Əl-Xəmis məsləkdaşı Ehsan İlahi Zəhirin "bütün şiələr Quranın təhrif olunduğunu düşünürlər" fikrini bununla izah etməyə cəhd göstərmişdir. Yəni Şiə alimləri Cəzairi və Nuri kimiləri təkfir etmədiklərinə görə onlarla eyni fikri bölüşmüş sayılırlar. (Əl-Xəmis O. "Şiə və Quran". www.almanhaj.net) İddianın absurdluğu aksiom olsa da, bunları deməyi lazım bilirik: Biz məzhəb olaraq, təkfirçi deyilik, müxalif fikirləri təkfirlə cavablandırmır, insanlara düşüncə və etiqad azadlığı tanıyırıq. Yaşadığımız cəmiyyətdə Quranın nəinki bəzi hissələrinin azaldığını düşünən, ümumiyyətlə, hamısının bəşər tərəfindən yazıldığını deyən, Allah-Taalanın nəinki kitabını, hətta Özünü belə inkar edənlər var və biz onları nə təkfir edir, nə də qətllərinə fərman veririk. Çünki dinimiz, Quranımız bizə belə deyir. Biz insanları söyməklə, lənətləməklə deyil, hörmətlə, ağıl və məntiqlə İslama dəvət etməyi vacib sayırıq. Biz müharibə vəziyyətinə aid hökmləri sülh şəraitində tətbiq etmir və nəticədə mütərəqqi İslama mürtəce don geyindirmirik. Bizim peyğəmbərimiz adi şəraitdə müşriklərlə də normal davranırdı, imamımız Cəfər Sadiq məsciddə ateistlərlə elmi mübahisə edir, suallarını cavablandırırdı, onları söyüb məsciddən qovmurdu.

Həm də unutmaq lazım deyil ki, Quranın təhrif edildiyinə dair xəstə təfəkkür Nurinin mənsub olduğu Əxbari cərəyanının vurduğu ziyanlardan yalnız biridir. Biz ümumiyyətlə, Əxbariliyi, onun düşüncə

və metodlarını yanlış sayırıq, lakin bu o demək deyil ki, Əxbari alimlərinin yazdığı bütün kitabları, o cümlədən Nuri Təbrisinin digər əsərlərini odda yandırmalıyıq. Onların işi əsasən, hansısa mövzu haqda hədisləri və ya alimlərin sözlərini toplamaqdan ibarət olub. Yəni Məclisinin Bihar və ya Təbrisinin Müstədrək kitabları müəlliflərinin fikirlərinə görə deyil, çoxlu kitablardan seçib topladıqları rəvayət və iqtibaslara görə dəyərlidir. Həmin kitabların bəzisi bizim dövrümüzə gəlib çatmayıb və biz belə ensiklopedik topluların hesabına onların müəyyən hissələrini bərpa edə bilirik.

Biz qeyri-şiələrin, hətta qeyri-müsəlmanların da yazdığı elmi əsərlərə hörmət edirik, eyni məzhəbi bölüşməsək də, dəyərli tarix kitabına görə Təbərini, obyektiv İslam araşdırmalarına görə Masinyonu uca tuturuq. Biz digərlərinin əsərlərindən, elmi fikirlərindən istifadə edərkən təəssübkeşlik etmir, din və məzhəbini araşdırmır, Şiəliyə və Əhli-beytə qarşı qərəzli mövqedə olan Lamens və Donaldsonun digər fikirlərini də qaralamırıq. Osman əl-Xəmisin hikkə ilə: "İş o yerə çatıb ki, Nurinin "Müstədrək əl-Vəsail" kitabı şiələrin mötəbər kitablarındandır" deməsi isə, nəinki elm adamına yaraşmayan yanaşmadır, hətta bu baxımdan əsl məzhəkəyə bənzəyir. Üstəlik, bu kitab heç də əl-Xəmisin və digər vəhhabilərin sandığı qədər uca tutulmur, əslində, Hürr Amilinin öz Vəsail kitabını toplayarkən zəif sayıb kənara qoyduğu hədislərdən ibarətdir və Şiə alimləri fətva verərkən ona istinad etməməyə çalışırlar.

Digər tərəfdən, Şiə hüququ o qədər mükəmməldir ki, əl-Xəmis kimilərin iman və küfr meyarlarını öyrətməsinə ehtiyac yoxdur. Biz bu meyarları kiminsə əks-təbliğatından, yaratdığı ajiotajdan deyil, Allahın kitabından və Peyğəmbərin sünnəsindən əxz edirik. Vəhhabilərin az qala bütün Orta Şərqi xarabalığa çevirməkdə olan küfr meyarları isə özlərinə qalsın.

Başqa izahı olmayıb məhz Quranın təhrifinə dəlalət edən azsaylı hədislərə (xatırladaq ki, qeyri-şiə mənbələrində belə hədislər dəfələrlə çoxdur) və hansısa Şiə alimlərinin yanlış fikrinə görə bütün Əhli-beyt

davamçılarını kafir adlandıran vəhhabilərə isə sözümüz budur: Quranın azaldığını düşünənləri kafir sayırsınızsa, ayrıseçkilik etməyin, cürətiniz çatırsa, lap əvvəldən – Quranın təxminən üçdə ikisinin çıxarıldığını söyləyən xəlifə və səhabələrdən başlayaraq hamısının hökmünü verin. Heç olmasa, təkfirçiliynizdə səmimi olun. Peyğəmbərin "(Ey Əli!) Sənə yalnız münafiq kin bəsləyər və səni yalnız mömin sevər" (Müslim, 1/86, h: 78; Əhməd, 2/71, h: 642; Albani, 4/298, h: 1720), "Əlini söyən məni, məni söyən də Allah-Taalanı söyüb" (Hakim Nişaburi, 3/130) dediyi halda, nə üçün Əliyə qarşı qiyama qalxan, onu öldürməyə çalışan, on minlərlə müsəlmanın qətlinə bais olan, şəhadətindən sonra da minbərlərdə ona lənət oxutduran (Müslim, 4/1871, h: 2404) Müaviyəni təkfir etmir, hətta çoxlu səhabələrdən uca tutursunuz? Allah və Rəsulu dəfələrlə Əhli-beyti, ən azı, onları sevməyi tapşırdığı halda, nə üçün Peyğəmbərin ciyərparəsinin başını kəsib qız-gəlinlərini əsir tutan Yezidi təkfir etmir, üstəlik, Əmirəlmöminin adlandırırsınız? Nə üçün bunlara çatanda rəvayətləri inkar edir, mümkün olmadıqda isə cinni-insin ağlına gəlməyən ehtimallarla vəziyyətdən çıxmağa çalışır, Əhli-beyt imamlarının səhabə və tərəfdarlarına gəldikdə isə ən zəif ehtimalla ən böyük iddialar qaldırır, küfr, qətl, cihad hökmləri verirsiniz?! Bunları, xüsusən də təhrif düşüncəsində olan səhabə və tabeiləri təkfir etmirsinizsə, onda heç kimi təkfir etməyin, lal-dinməz yerinizdə oturun, iftiralardan əl çəkin, bir neçə nəfərin fikrini bütöv bir məzhəbə aid etməyin.

Sələfilərin mövcud Quranla razılaşmayan, ona nə isə artırmağa və ya ondan nəyisə çıxarmağa çalışan səhabələri təkfir etdiyini görə bilməzsiniz. Onlar bundan ötrü "Oxunuşun nəsxi" nəzəriyyəsini düşünsələr də, hətta bu "nəzəriyyə"yə uyğun gəlməyənləri də təkfir etmir və Abdullah ibn Məsudda gördüyümüz kimi, hansısa yolla təmizə çıxarırlar. Onlar səhabə olmayan və Quranın təhrif olunduğunu söyləyən qeyri-şiə alimlərini – Mücahidi, Zöhrini, Süfyan Saurini, İbn Şənbuzu da təkfir etmirlər. Onlar əsassız olaraq Kuleynini

təkfir edirlər, amma kitablarında çoxlu təhrif hədislərini qeyd etmiş səhih və sünən müəlliflərinə rəhmət oxuyurlar. Halbuki onlar bu hədislərin oxunuşun nəsxinə aid olduğunu da söyləməyib, səhih hədis olaraq yazıblar. Bu nə deməkdir?! Məgər təkfir qaydası - əgər əsaslıdırsa - yalnız şiələrə aiddir?!

Bir daha xatırlatmağı vacib bilirik ki, biz kiminsə təkfir edilməsinin tərəfdarı deyilik, yuxarıda işarə vurulan meyarlara görə kimisə kafir hesab etmirik. Heç İmam Əlinin özü də ona qarşı vuruşanları kafir saymayıb, döyüşdə öldürülənlərin hamısını müsəlman kimi dəfn edib. Bu sözlərimiz təkfirçilərin ikili standartlarına etirazdır.

Biz indi diqqəti başqa bir məqama yönəltmək istəyirik: Hörmətli sələfilər! Tutaq ki, sizin hədis kitablarınızda təhrifə aid bircə nümunə belə yoxdur və heç bir aliminiz belə bir iddiada olmayıb. Əksinə, 100 il öncəyə qədər istisnasız olaraq, bütün Şiə alimləri Quranın təhrif olunduğunu deyiblər. Amma 100 ildir bu firqənin alimləri sələflərinin səhvini başa düşmüşlər və Quranın təhrif edilmədiyini söyləyirlər. Əgər belədirsə və bu firqə hidayət yolunu tapıbsa, nə üçün buna sevinib müsəlmanları təbrik etmir, hələ üstəlik, (fərzimizə uyğun olaraq) qədim alimlərin sözlərini bayraq edib indiki şiələri də kafir sayırsınız? Əgər sizin məqsədiniz bəşəriyyətin hidayətidirsə, nə üçün hər hansı məzhəb haqda mühakimə yürüdərkən indiki etiqadlarını deyil, (fərzimizə uyğun olaraq) 100 il qabaqkı etiqadlarını əsas götürürsünüz? Sizdə baş kəsməkdən, qan tökməkdən başqa hidayət yolu yoxdurmu?

### 5. 1. Qeyri-şiə alimlərinin rəyi

Quranın təhrif edildiyini, onun bəzi hissələrinin mövcud Quran kitabından çıxarıldığını düşünən bəzi əxbarilər çox pis və yanlış düşüncədə olmalarına baxmayaraq, nəinki şiə, hətta bir çox sünni və sələfi alimlərə görə də kafir sayılmırlar, onları təkfir etmək hətta sələfilərin dini əsaslarına görə də yolverilməzdir. Çünki onların bu

fikrə düşməsinə bəzi hədislər səbəb olmuşdur. Və bu alimlər bəziləri kimi kimlərəsə külli miqdarda pul verib yalan hədis qoşdursaydılar, onları xəyanətdə günahlandırmaq olardı. Onlar isə qabaqcadan uydurulmuş belə hədisləri düzgün araşdırma metodlarını bilməmişlər, dominant düşüncəyə çevrilmiş Əxbarilik onları bəlli fikirlərə sövq etmişdir. Onların günahı elmi əsaslarının yanlışlığı və bunun da nəticəsində yanlış elmi nəticələrə gəlmələridir. Buna isə Sələfizmin banisi İbn Teymiyyənin sözləri ilə cavab vermək istəyirik. O yazır: “Quranın Allah kəlamı olmadığını deyən şəxs iftiraçı və bidətçidir... Təkfirə gəldikdə isə, doğrusu budur ki, Məhəmməd ümmətindən ictihad edən və haqq niyyətilə səhvə yol verən təkfir olunmur. Əslində, onun səhvi bağışlanacaqdır. Amma kimin üçün Peyğəmbərin gətirdikləri aydın olsa və o, hidayəti açıq-aşkar dərk etdikdən sonra Peyğəmbərə qarşı çıxıb möminlərin yolundan ayrısına üz tutsa, kafirdir... Hər xətakar və bidətçi, hər cahil və sapqın nəinki kafir, heç fasiq və günahkar da hesab olunmur”. (İbn Teymiyyə. "Məcmu əl-fətava", 12/179-180) Bir qədər sonra isə yazır: “Sələflərdən çoxları çoxlu belə məsələlərdə səhvə yol vermiş, amma bununla təkfirin yolverilməz olduğuna dair həmfikir olmuşlar. Məsələn... bəzi sələflər Quranın bəzi hərflərini inkar etmiş, “yəyəs” sözünü “yətəbəyyən”, “qada” sözünü “vassa” kimi oxumuş, bəzisi Fələq və Nas surələrini Qurandan çıxarmış, bir başqası ona Qünut surəsi əlavə etmişdir. Bunlar icma və mütəvatir nəqlə əsasən, səhvdir, lakin onların nəzərində mütəvatir olmadığına görə təkfir olunmurlar. Mütəvatir nəqllə höccət tamamlanan (qəti dəlilləri qəbul etməyə bilməyən) şəxs isə kafir olur”. (Yenə orada, 12/492-493) İbn Teymiyyə həmçinin deyir: "Səhvə yol vermiş heç bir müsəlman alimi ictihadına görə təkfir etmək olmaz. Alimləri kafir adlandırmaqla cahilləri onların canına salmaq çox xoşagəlməz haldır... (Hədisdə deyildiyi kimi) alim ictihad edərkən doğru nəticə aldıqda iki savab, yanlış nəticə aldıqda isə bir savab etmiş olur". (Yenə orada, 35/100, 103)

Bəlli təkfirə qarşı etirazlardan və İbn Teymiyyənin uyğun fikrinin yayılmasından sonra Osman əl-Xəmis onun ümumi şəkildə dediyi bir sözünü saytına yerləşdirərək əsassız fikrinə bəraət qazandırmağa çalışmışdır. (Əl-Xəmis O. "Hökm Şeyxülislam limən yətəqid təhrif əl-Quran". www.almanhaj.net) Halbuki yuxarıda göründüyü kimi, İbn Teymiyyə məsələyə dair mövqeyini məhz burada detallarıyla açıqlamış və hansısa şübhə səbəbindən yanlış elmi nəticə almış alimləri təkfir etməmişdir.

Vəhhabi sələfizminin banisi Məhəmməd ibn Əbdülvəhhabın bəzi fikirləri də bu baxımdan diqqətəlayiqdir: "Kitabın (Quranın) və mütəvatir sünnənin dəlillərini rədd etmək küfrdür, ancaq bunları rədd edənin kafirliyinə hökm çıxarmaq olmaz. Burada cəhalət, aşkar mətnə qarşı çıxdığını bilməmək, yaxud onun mənasını anlamamaq kimi amillər ola bilər". (Nəcd alimləri. "Əd-Dürər əs-səniyyə", 10/432-433)

Eyni fikri qədim Əhli-sünnə alimlərindən də söyləyənlər az olmayıb. Nümunə üçün, Beyhəqinin bu cümləsini qeyd etmək olar: "Son iki surənin Qurandan olduğunu inkar edən dindən çıxmır, çünki buna (ciddi elmi) şübhə səbəb olmuşdur". (Beyhəqi Ə. "Əs-Sünən əl-kubra", 10/349, h: 20899) Əhli-sünnə arasında ən çox tərəfdara malik olan firqə imamı Əbülhəsən Əşəri isə deyirdi: "Mən qiblə əhlindən heç kimi təkfir etmirəm. Çünki hamı eyni tanrıya üz tutur. Fərq və ixtilaflar isə yalnız sözlərdədir". (Yenə orada) Yaxud Misirin görkəmli Hənəfi alimlərindən olmuş İbn Nüceym yazır: "Ortada güclü şübhə olduğu təqdirdə qəti inkar küfrə bais olmur; necə ki, Bismillah ayəsində belədir". (İbn Nüceym Z. "Əl-Bəhr ər-raiq", 1/330-331)

Heç şübhəsiz, bəzi Əxbari alimlərinin Quranın təhrif olunduğunu düşünmələrinə də Şiə və Əhli-sünnə kitablarının uyğun hədisləri bais olmuşdur. Əxbarilərin yanlış elmi metodlarını da nəzərə alsaq, bu, ciddi şübhədir və ciddi şübhəyə əsasən, ictihad edib yanlış nəticə alan alim kafir sayıla bilməz. Doğrudur, nass – Quranın təhrifdən qorunacağını bildirən ayələr qarşısında ictihad yolverilməzdir. Lakin unutmayaq ki, hər bir mətni müxtəlif cür izah

etmək olar və Quranın çoxlu ayələrini müxtəlif firqələr tam fərqli şəkillərdə açıqlayırlar. Heç şübhəsiz, sözügedən alimlər də uyğun ayələri, yanlış olaraq, Quranın azalma təhrifindən də qorunacağına dəlil kimi başa düşməmişlər.

Bütün bunlardan sonra israrla əxbarilərin təkfir edilməsini tələb edən vəhhabi alimlərini, onların bu israrlarının mənşəyini anlamaq çox da çətin deyil və bunu vəhhabizmin hətta İbn Teymiyyə daxil bütün müsəlmanlardan fərqlənən təkfirçi mahiyyətində axtarmaq lazımdır. Maraqlıdır ki, bu tələbdə olanlar özlərini "təkfirçi", "xəvaric" deyil, mötədil sələfi adlandıranlardır. Belələrindən soruşmaq lazımdır ki, siz Allahın rəsulumusuz, yoxsa səlahiyyətli səfiri?! İnsanların inanc və əməllərini təftiş etmək səlahiyyətini sizə kim verib?! Ümumiyyətlə, İslamın harasında təkfir sünnəsi var və təkfir etməyənlər üçün hansı cəzalar nəzərdə tutulub ki, bu qədər əl-ayağa düşüb müsəlmanları kafir elan etməyə can atırsınız?!

Sonda qeyd edək ki, Şiə alimləri arasında da kimisə düşüncəsinə görə təkfir edən olub, xüsusən firqələrarası iğtişaşlar dövründə bəzi alimlər çox nahaq yerə bəzi firqə və ya məzhəbləri kafir sayıblar, lakin bu hal Şiəlikdə hakim ənənə deyil, həmişə müəyyən şəxslərin subyektiv fikri olub. Ümumiyyətlə, İslamın ilk əsrlərində firqə və məzhəblər arasında dözümsüzlük güclü olub, onlar bir-birini təkfir ediblər. Sələfilik isə bu gün də həmin dövrü yaşayır və əsrlərin elmi-praktik inkişafı nəticəsində belə hallara son qoymuş müsəlman ümmətini həmin dövrə qayıtmağa çağırır.

**5. 2. Şiə alimlərinə təqiyyə ittihamı**

Vəhhabi sələfilərinin başa düşmədiyi, yaxud düşmək istəmədiyi mövzulardan biri də təqiyyədir. Hər bir normal insanın qəbul etdiyi ağıllı və ehtiyatlı gediş olan təqiyyəni bəzən riyakarlıq, yalan və hiyləgərlik kimi qələmə verirlər. Onlar açıq-aşkar Quranın təhrif olunmadığını söyləyən çoxsaylı Şiə alimlərinin təqiyyə etdiklərini, əslində isə bu fikirdə olduqlarını bildirirlər. (Xətib M. "Əl-Xütut əl-

ərizə", 14-15; Qəfari N. "Üsul məzhəb əş-Şiə əl-İmamiyyə", 1/219-220) Burada təqiyyə barədə geniş danışmaq imkanımız olmasa da, məsələ üzərində azca dayanmaq lazım gəlir; hərçənd, əslində, onlar buyurub elmi dəlillərlə fərziyyələrini isbat etməlidirlər.

Nuri Təbrisinin təkfir edilməməsi, Nəcəfdə dəfn olunması, digər kitablarının oxunması və sair belə əsassız bəhanələrlə 400 milyon şiənin küfrünə hökm çıxarmaq ən azı dəhşətdir və bu təfəkkür tərzini "təkfir eşqi" adlandırmaq daha doğru olar. Bəlkə də belə ifrat "eşq" səbəbindən onlar qeyri-təkfirçiləri anlamaq nemətindən məhrumdurlar. Şiə alimləri Nurini çox sərt sözlərlə tənqid etmişlər. Lakin istənilən halda, elementar məntiq qaydalarına görə, təkfir etməmək onunla razılaşmaq demək deyil, əslində təkfir meyarları fərqli ola bilər. İman və küfr barədə müxtəlif məzhəblərdə müxtəlif meyarların olması isə çox normaldır və yerində dartışıla bilər. Necə ki, biz bir çox sələfi alimlərindən fərqli olaraq, namaz qılmayanları təkfir edib qətllərinə fərman vermirik, amma eyni zamanda hərəkətlərinə bəraət qazandırmır və böyük günaha yol verdiklərini söyləyirik.

Yuxarıda Şeyx Səduq haqda danışarkən toxunduq ki, onun, eləcə də, Şeyx Müfidin və Seyid Mürtəzanın bütün həyatlarını əhatə edən 100 ildən artıq bir dövrdə Şiə etiqadlı Ali-Buyə ailəsi hakimiyyətdə olub, hətta istədikdə Abbasi xəlifəsini dəyişib. Həmçinin Səfəvilər dövründə də heç bir təqiyyə şəraiti olmayıb, amma çoxlu alimlər Quranın təhrif olunmadığını açıq söyləyiblər. Müasir dövrdə də təqiyyəyə heç bir əsas yoxdur və hər hansı təqibə məruz qalanlar ən mütərəqqi ölkələrdə sığınacaq ala bilirlər. Bu arada Şiənin ümumi imicinə hər hansı xələl gəlməsindən çəkinib təqiyyə etmələri də real deyil. Qeyd etdik ki, Quranın təhrifi üçün istinad olunan "rəvayətlər" ən pis halda onun ayələri daxilindən hansısa sözlərin çıxarıldığına əsas verə bilərdi. Buna isə güclü elmi dəlillər olsaydı, əsla təqiyyə etməz və fikirlərini əsaslandırardılar. Çünki Allahın kitabının təhrif edilməsi qarşısında susmaq təqiyyə yox, xəyanət və nankorluqdur. Quranın təhrif edildiyini söyləyənlər buna görə söyləyiblər,

söyləməyənlər də onun həqiqətən təhrif edilmədiyini bildikləri üçün söyləməyiblər. Quran təhrif edilmiş olsaydı, bütün Şiə alimləri bunu söyləyər, onu təhrif edənləri tənqid edər, uzaqbaşı, İslamın erkən çağında, Peyğəmbərin vəfatından sonra baş verən bir çox hadisələr kimi üstünü vurmaz və birlik yaratmaqdan ötrü susmağa üstünlük verərdilər, daha müxtəlif əqli və nəqli dəlillərlə inkar etməz, təsdiqləyənləri qınamazdılar.

Ehsan İlahi Zəhirin iddiasına görə, Səduq, Mürtəza, Tusi və Təbrisinin təhrifə zidd fikirləri heç bir əqli və ya nəqli dəlilə dayanmır, yalnız təqiyyə məqsədi daşıyır. Müasir Şiə alimləri də əslində Quranın təhrif olunduğunu düşünürlər, amma bu fikrin onların bütün məzhəblərini və hətta imamət etiqadlarını kökündən uçurduğunu görüb təqiyyə edir və düşüncələrinin əksini söyləyirlər. (Ehsan İlahi Zəhir, 91)

İddiaların nə qədər absurd və gülünc olduğu göz önündədir. Əvvəla, adları çəkilən dörd alim Quranın təhrif olunmadığına dair rəylərini kifayət qədər əsaslandırıblar və bunu bilmək Nuri Təbrisinin bədnam kitabını bir kənara qoyub onların öz əsərlərinə müraciət etmək qədər bəsit bir işdir. Müasir alimlərin təqiyyəsinə gəldikdə isə, yenə yada salmalıyıq ki, söhbət Qurana hansısa əlavələrin edilməsindən deyil, yalnız bəzi sözlərin müəyyən ayələrdən çıxarılmasından gedir və belə bir iddia nəinki digər Şiə etiqadlarına və imamət nəzəriyyəsinə zərbə vurmur, hətta onları gücləndirir də. Və elə məhz buna görə Nuri kimilər uyğun iddianı etmiş, mövzu ilə əlaqəsi olmayan dəlillərə də üz tutmuş və tarixin qınağını qazanmışlar.

Mövzuda təqiyyənin olmadığına bir dəlil elə məhz böyük Şiə alimlərinin sözgəlişi və dəlilsiz deyil, ən güclü dəlillərlə təhrifi rədd etmələridir. Onlar ya Şiə etiqadlarına, ya Qurana dair, ya da Nuriyə qarşı yazdıqları əsərlərində Qurana, sünnəyə, ağla və tarixi faktlara istinadla bunu sübuta yetirmişlər. Belə olan halda hansı təqiyyədən söhbət gedə bilər?! Quranın təhrif olunduğunu qətiyyətlə və dönə-

dönə inkar edən Şiə alimlərinə zorla təhrif düşüncəsini yapışdırmağa cəhd edən əxbari və vəhhabilər bununla Qurana xidmət etdiklərinimi düşünürlər?!

Bütün müsəlmanlarda tarix boyu eyni Quran olub və var. Bu gün demək olar bütün müsəlmanlar və İslam alimləri Quranın təhrif edilmədiyini söyləyirlər. Və bütün bunlar birlik amili olmalıdır. Lakin təəssüf ki, müsəlmanları İslamın ilk əsrlərinə qaytarmaq istəyən sələfilər bu günlə deyil, keçmişlə düşünür, keçmişə görə qiymət verir və mühakimə yürüdürlər; həm də çox təəssüf ki, qərəzli və qeyri-obyektiv tərzdə. Onların spesifik xüsusiyyəti erkən İslam çağının gözəl xüsusiyyətlərinə, Peyğəmbər dövrünün sarsılmaz qardaşlığına deyil, bir qədər sonrakı məzhəb ixtilaflarına, firqələrarası qarşıdurmalara, bir-birini təkfiretmə ənənəsinə dəvətdən ibarətdir. Görünür, İslam dünyasının belə ağır durumunda, düşmənlərin onları parçalamaq üçün hər gün yeni sürprizlər təqdim etdiyi bir gündə kimlərsə müsəlmanları “kafir”, “müşrik” adlandırıb daha da parçalamaq, cin və insanlardan olan şeytan dostlarını sevindirmək istəyirlər.

# ALTINCI FƏSİL: ŞİƏ ETİQADLARI VƏ QURAN

Bəzi qərəzli vəhhabilərin iftirasına görə, Şiə etiqadları Qurana zidd olduğundan bu firqənin alimləri onun təhrif olunduğunu düşünürlər. Biz sözügedən alimlərin belə bir düşüncədə olmadıqlarını yuxarıda sübut etdik. Lakin bu iftiranın birinci hissəsi diqqətimizi çəkdi. Gəlin görək Şiə etiqadları Qurana ziddirmi ki, kimsə buna görə Quranın təhrif olunduğunu söyləməyə ehtiyac duysun?!

Əvvəla, Əhli-beyt yoluna nifrətdən gözləri tutulan, beyinləri quruyan adamlar əgər həqiqətən din alimidirlərsə, bilmiş olmalıdırlar ki, Quranın təhrif olunduğunu düşünən bir neçə əxbari alimi də ona əlavələr edildiyini qətiyyətlə rədd ediblər. Bu baxımdan, bütün şiə və sünni alimlər mövcud Quranın Allah kəlamı olduğunu düşünürlər və onun hər hansı inanca uyğun olub-olmaması heç bir əhəmiyyət kəsb etmir. Halbuki Şiə etiqadları hər hansı Quran ayəsinə zidd olsaydı, həmin ayələrin sonradan əlavə olunduğunu söyləməli idilər ki, belə bir söz söyləyən yoxdur.

Digər tərəfdən, Şiə alimləri təfsirə və digər Quran elmlərinə dair minlərlə kitab yazmış və öz etiqadlarına zidd olan heç bir ayə ilə rastlaşmamışlar. Şiə alimləri təvəssül, təbərrük, şəfaət, imamət, ismət, Allahdan qeyrisinə and içməyin haram və küfr olmaması və digər etiqadlarını əsasən Quranla isbat edir və bunda heç bir çətinlik çəkmirlər. Şiə bəlkə də yeganə mühüm firqədir ki, inanclarının böyük əksəriyyətini və çoxlu hüquqi məsələlərini Qurana və müxalif məzhəblərin mənbələrinə istinadla sübuta yetirir. Bu baxımdan, öz

etiqadi əsaslarına nəinki şübhə etmir, hətta oyunu meydançanın rəqibə aid hissəsində aparır.

İndi isə Əhli-beyt məzhəbi olan Şiəliklə Sələfilik arasında əsas etiqadi fərqi qısa şəkildə araşdıraq:

Əhli-beyt davamçıları insanları Quran, sünnə və Əhli-beyt yoluna, sələfilər isə Quran, sünnə və sələflərin yoluna dəvət edirlər. Onlar "sələf" dedikdə səhabələri və onlardan sonra gələn iki nəsli, yaxud İslam tarixinin ilk üç əsrinin görkəmli şəxslərini nəzərdə tuturlar. Göründüyü kimi, fikir ayrılığı yalnız üçüncü qaynaqdadır. Belə ki, Əhli-beyt davamçıları Quran və sünnənin, İslam etiqadlarının və şəriətinin mübahisəli məsələlərini Əhli-beytdən – yəni Peyğəmbərin öz ailəsi arasından seçdiyi və elminin varisi olan xüsusi şəxslərdən, sələfilər isə digər səhabə, tabei və alimlərdən öyrənirlər. Görək bunların hansı biri kitab və sünnəyə əsaslanır? Yəni Quranın və Peyğəmbərin özü fikir ayrılığı zamanı kimə müraciət etməyi tapşırmışdır?

Öncə qeyd edək ki, bəhanələrin qarşısını almaq üçün burada da Əhli-beyt vasitəsi ilə deyil, digər səhabə və tabeilər vasitəsi ilə nəql olunan Peyğəmbər hədislərindən istifadə edəcək, Şiə kitablarından deyil, sələfilərin mötəbər saydığı kitablardan sitatlar gətirəcəyik.

### 6. 1. Əhli-beyt yolunun dəlilləri

**1. Təthir ayəsi:** "Ey Əhli-beyt! Allah sizdən hər bir çirkinliyi yox etmək və sizi paklamaq istər!" (Əhzab/33)

Təbii ki, ayədə məqsəd fiziki çirkinlik deyil, mənəvi və əxlaqi qüsurlar, günah və sapınmalardır. İslam hədislərinə əsasən, "Əhli-beyt" sözündə məqsəd isə Peyğəmbərin bütün ailə üzvləri yox, Əli, Fatimə, Həsən və Hüseyndir. Nümunə üçün, Səhih-Müslimdə nəql olunmuş hədisə nəzər salaq:

Aişə deyir: "Peyğəmbər səhər çağı çiynində yun parça otaqdan çıxdı. Həsən ibn Əli gəldi. Peyğəmbər onu əbanın altına saldı. Sonra Hüseyn gəldi - onu da əbanın altına saldı. Sonra Fatimə gəldi - onu da

əbanın altına saldı. Sonra Əli gəldi - onu da əbanın altına saldı. Daha sonra isə bu ayəni oxudu: "Ey Əhli-beyt! Allah sizdən hər bir çirkinliyi yox etmək və sizi paklamaq istər!" (Müslim, 4/1883, h: 2424)

Hədis əksər rəvayət kitablarında mövcuddur və məzhəbindən asılı olmayaraq, demək olar ki, bütün alimlər tərəfindən qəbul olunur. Tirmizinin nəql etdyi oxşar hədisdə isə deyilir ki, hadisə Ümm Sələmənin evində baş vermiş, bu zaman Ümm Sələmə Peyğəmbərdən soruşmuşdur: "Ey Allahın rəsulu, mən də Əhli-beytdənəmmi?!" Peyğəmbər isə onu əbanın altına salmayaraq buyurmuşdur: "Sən öz yerində qal, sən xeyirdəsən" (Yəni Əhli-beytdən sayılmırsan). (Tirmizi, 6/132, h: 3787)

Bu ayəyə əsasən, Əhli-beyt günahlardan uzaqdır və yolunu azmaz. Odur ki, mübahisəli məsələlərdə etimadlı mənbə tapmaq üçün uzağa getmək lazım deyil, Quranın xüsusi mesajlara malik bu kimi ayələrinə əməl etmək və Əhli-beytə üz tutmaq lazımdır.

**2. Səqəleyn hədisi:** Cabir ibn Abdullahın rəvayətinə əsasən, Allahın rəsulu həcc zamanı, Ərəfə günü müsəlmanlara buyurdu: "Ey müsəlmanlar! Mən sizin aranızda elə şey qoyub gedirəm ki, onunla olduğunuz təqdirdə yolunuzu azmazsınız: Allahın kitabı və Əhli-beytim. (Tirmizi, 6/131, h: 3786)

Zeyd ibn Ərqəmin rəvayətində isə belə buyurur: "Mən sizin aranızda elə şey qoyub gedirəm ki, onunla olduğunuz təqdirdə yolunuzu azmazsınız. Onların daha böyük olanı Allahın kitabıdır... O birisi isə Əhli-beytimdir. Onlar qiyamətə qədər bir-birindən ayrılmazlar". (Tirmizi, 6/133, h: 3788)

İslam alimlərinin böyük əksəriyyəti, o cümlədən məşhur sələfi hədisşünası Şeyx Albani bu iki hədisi, eləcə də Səhih-Müslim, Müsnəd-Əhməd və digər kitablarda yer almış oxşar hədisləri səhih sayır. Peyğəmbər bu hədisi dəfələrlə, həm də ömrünün sonunda buyurmuş, son vəsiyyəti kimi Quranı və Əhli-beyti tapşırmışdır. Yuxarıdakı Təthir ayəsindən əlavə, bu mütəvatir hədis də Əhli-beytin

məsum olduğunu göstərir. Peyğəmbər bu hədislə Əhli-beytin söz və əməllərinin doğruluğuna, hidayətdən kənar və Qurandan ayrı olmadığına zəmanət vermiş olur. Bundan əlavə, bu hədisə əsasən, Peyğəmbərin hər hansı məsələyə dair fikrini məhz Əhli-beytdən öyrənmək lazımdır. Çünki Peyğəmbərin öz övladlarının – haqqında bu qədər fəzilətlər bəyan olunmuş Əhli-beytin nəql etdiyi hədislər digər səhabə və tabeilərin nəql etdiklərindən daha etibarlıdır və Peyğəmbərin özü məhz bunu vəsiyyət etmişdir.

Əhli-beytə dair həmçinin Məvəddət, Vilayət, İtaət, Mübahilə və digər ayələri, On iki əmir, Qədir-Xum, Nuh gəmisi və digər hədisləri də qeyd etmək olardı. Lakin yuxarıdakı bir ayə və bir hədisin yetərincə konkretliyini nəzərə alıb yazını uzatmaq istəmirik.

**6. 2. Sələf yolunun dəlilləri**

İndi isə İbn Teymiyyə, İbn Qəyyim başda olmaqla sələfilərin dəvət etdiyi yolun dəlillərini araşdıraq:

**1. Tövbə surəsi, ayə 100:** "(İslamı) ilk əvvəl qəbul edib (bu işdə başqalarından) irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. (Allah) onlar üçün əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur (uğurdur)!"

Qeyd etmək lazımdır ki:

Əvvəla, ayədəki "irəli düşən mühacirlər və ənsar" məhz Allaha iman gətirməkdə irəli düşənlərdir. Bu baxımdan, ayə İslam inancına dairdir və hər məsələdə deyil, bu məsələdə ilk səhabələrə tabe olanlar təriflənir, onlara Allahın razılığı və cənnət vəd olunur. Təbii ki, İslam dəvətinin ilk çağlarında, məşəqqət dolu Məkkə dövründə müsəlman olanların imanı daha səmimi və düzgün olmuşdur. Odur ki, digər insanlara da belə səmimi və təmənnasız iman gətirmək tövsiyə olunur.

İkincisi, Quranın bir ayəsindən tələsik hökm çıxarmaq olmaz, hər hansı hökmdən qabaq onun bütün ayələrini araşdırmaq lazımdır.

Quranın “Allaha və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz, açıq-aşkar azmışdır!” (Əhzab/36), “Kim zərrə qədər pis iş görmüşdürsə, onu görəcəkdir (cəzasını çəkəcəkdir)” (Zilzal/8) kimi çoxlu ayələrinə əsasən, demək olar ki, bu ayə səhabələrin iman gətirməsi ilə bağlıdır və onların bütün əməllərinə yekun qiymət sayılmır. Həm də səhabələrin doğru və haqlı əməllərində onlara tabe olmaq lazımdır, hər əməldə yox.

Üçüncüsü, səhabələr arasında kifayət qədər fərqli, bir-birinə zidd və hətta düşmən fikirlər mövcud olmuşdur. Belə olan halda, Allah onların hamısını höccət və meyar təyin edə bilərmi?! Hikmətli Allahın müsəlmanları belə ziddiyyətli yollar ayrıcında qoyması mümkündürmü?! Üstəlik, dərhal sonrakı ayədə deyilir: “Ətrafınızdakı bədəvilər və Mədinə əhalisi içərisində ikiüzlülüyü özlərinə adət etmiş münafiqlər vardır. Sən onları tanımazsan, Biz isə onları tanıyırıq”.

Dördüncüsü, ayənin özü bu təfsiri inkar edir və səhabələrin əməllərinin höccət olmamasına əsas verir. Çünki əvvəla, onlar bir-birinin əməllərini höccət saymamışlar və onlara tabe olsaq, biz də höccət saymamalıyıq; ikincisi isə, fikir ayrılığı olan məsələlərdə birinin əməlinə tabe olmaq, mütləq o birinə tabe olmamaqla nəticələnir.

**2. Səhih-Buxari, hədis: 2652, 3651, 6429:** "Ən xeyirli insanlar (və ya nəsil) mənim dövrümün insanlarıdır, sonra onların ardınca gələnlər, sonra da onların ardınca gələnlər".

Qeyd etmək lazımdır ki:

Əvvəla, hər hansı dövrün adamlarının xeyirli olması nisbi məsələdir və onların hamısının əməllərinin düzgün və ya xeyirli olmasına dəlalət etmir. Həmin dövr əslində faiz etibarilə yaxşı insanların sayı, İslamın möhkəmlənməsi və yaxud Əhli-beyt imamlarının məhz həmin dövrdə yaşaması baxımından xeyirli ola bilər.

İkincisi, insanların xeyirli olması onların əməllərinin digərlərinə meyar olması anlamına gəlmir. Yalnız məsum olanların əməlləri

meyar ola bilər ki, səhabələr barədə belə iddia yoxdur. Səhabələrin icmasına – onların hamısının ortaq düşüncə və əməllərinə gəldikdə isə, bunlar o qədər azdır ki, mövcud ixtilafların həllində rol oynamırlar.

Üçüncüsü, həmin dövrün alimləri, səhabə və tabeilər arasında yetərincə konflikt olmuş, bəzən bir-birini kafir saymış, hətta qətlə yetirmişlərsə, əksər firqə və məzhəblər də məhz həmin dövrdə yaranmışdırsa, o – yəni İslamın ilk üç nəsli və ya əsri necə meyar ola bilər?!

**3. Hidayət hədisi:** İbn Abbasdan nəql olunan hədisdə Peyğəmbərin belə buyurduğu qeyd olunub: “Mənim səhabələrim ulduzlar kimidir. Hansına üz tutsanız, hidayət olarsınız”.

Qeyd etmək lazımdır ki:

Əvvəla, hədisin sənədi zəifdir. Əhməd ibn Hənbəl, Dariqutni, İbn Həzm, Beyhəqi, İbn Əsakir, İbn Cövzi, İbn Həcər Əsqəlani, Süyuti, İbn Teymiyyə, Şovkani, Albani və digərləri onu zəif saymışlar.

İkincisi, hədisin mətni də problemlidir. Belə ki, hər bir ulduz yolçuya düzgün istiqamət göstərmir. Bu, xüsusi ulduzlara aiddir.

Üçüncüsü, qəti tarixi faktlar bunu inkar edir. Tarixdə bəzi səhabələrin yollarını azması, haqdan dönməsi, bir-birini qətlə yetirməsi qeyd olunub. Bu baxımdan, onların hamısı hidayət məşəli ola bilməzlər.

Bu tip hədislər Peyğəmbərin Əhli-beyt haqqında buyurduğu bəzi hədislərə qarşı uydurulub. Məsələn, Hakim Nişapuri Buxari və Müslimin şərtlərinə cavab verən səhih sənədlə nəql etdiyi hədisdə Peyğəmbərin belə buyurduğunu yazır: “Ulduzlar insanları suda qərq olmaqdan qoruduğu kimi, Əhli-beytim də ümmətimi ixtilafdan qoruyur. Hansı ərəb qəbiləsi ona qarşı çıxsa, ixtilaf törətmiş və şeytan dəstəsindən olmuşdur”. (Hakim Nişaburi, 3/162, h: 4715)

**4. İftiraq hədisi:** Peyğəmbərə aid edilən bir hədisdə deyilir: "Yəhudilər 71 firqəyə, məsihilər 72 firqəyə böləndülər. Mənim ümmətimsə 73 firqəyə bölünəcək". Bəzi hədislərdə belə bir əlavə var: "Birindən başqa onların hamısı cəhənnəmlikdir". Qurtulacaq firqə haqqında da Şiə və Əhli-sünnə hədislərində müxtəlif fikirlər gözə çarpır. Belə ki, "Ey Peyğəmbər! Qurtulacaq firqə hansıdır?" – deyə soruşana onun "Camaatla olan", "Mənim və səhabələrimin yolu", "Əhli-beytimin yolu", "Mən və şiələrim (ardıcıllarım)" və digər cavablar verdiyi bildirilir. Sələfilər bu hədisdən istifadə edərək səhabələrin yolunu xilas olacaq yeganə yol sayır, bəziləri isə aldıqları təkfir tərbiyəsinə uyğun olaraq, Əhli-beyt yolu olan Şiəliyi ümumiyyətlə 73 firqədən hesab etmir və İslamdan kənar adlandırırlar.

Qeyd etmək lazımdır ki:

Əvvəla, bu hədis sənəd baxımından etibarsızdır. O, Əhli-sünnənin iki Səhih kitabında, eləcə də Şiənin dörd əsas hədis kitabında gəlməmişdir. Sənəd baxımından qüsurlu olan "Rövzə əl-Kafi"də və digər Şiə kitablarında, həmçinin sünni mənbələri arasında Müsnəd-Əhməd, Sünən-İbn Macə və digər əsərlərdə qeyd olunmuşdur. Rəvayət sənədində mövcud qüsurlara görə məşhur hədisşünas alim İbn Həzm yazır ki, bu hədis hətta etiqadi məsələlərdə vahid hədisi mötəbər sayanların meyarına əsasən də səhih deyil. (İbn Həzm Ə. "Əl-Fəsl fi əl-miləl", 3/138) Sələfi imamı Şovkani hədisin "birindən başqa hamısı cəhənnəmlikdir" hissəsini zəif sayır. Yeri gəlmişkən, Əbu Davudun, Tirmizinin, İbn Macənin, İbn Hibbanın və Hakimin Əbu Hüreyrədən nəql etdiyi oxşar hədislərin zəif olmasından əlavə, onlarda bu hissə yoxdur. İbn Vəzir bütün hədisi, xüsusən də sözügedən hissəni şübhə altına salaraq onun İslama zərbə vurmaq üçün dinsizlər tərəfindən artırıldığını istisna etmir.

Müasir Əhli-sünnə alimi Şeyx Yusif Qərzavi də bəzi rəvayətçilərini nəzərə alaraq, hədisi zəif hesab edir. Qərzaviyə görə, bəzi hədisşünaslar, o cümlədən İbn Teymiyyə müxtəlif vasitələrlə nəql olunduğuna görə onu səhih saymışdır. Halbuki hədisin məzmunu

nöqsanlı, yaxud ona müxalif ayə və ya hədis mövcud olduqda bu qayda ilə səhih saymaq doğru deyil. Necə ki, hədisşünaslar bir çox hədisləri məhz buna görə səhih saymamışlar. (Qərzavi Y. "Əs-Səhvə əl-islamiyyə", 34-39)

İkincisi, müəyyən şərtlərə görə hədisi qəbul etmək mümkün olsa da, bu yalnız birinci hissəsinə aiddir. Həm də ən azından xəbər vahiddir və belə hədislərlə müsəlmanların imanını şübhə altına salmaq olmaz.

Üçüncüsü, hədisin mətnində ciddi qüsurlar var və Qurana ziddir. Bu hədis İslam ümmətini xristianlıq və yəhudilikdən də pis və cəhənnəmlik ümmət kimi göstərir. Hələ qurtulacaq firqənin yalnız sələfilikdən ibarət olduğunu düşünsək, vəziyyət çox bərbad olar və kiçik bir qrupu çıxmaqla bütün müsəlmanların cəhənnəmə gedəcəyini söyləmək lazım gələr. Bu isə "Ali-İmran" surəsinin 110-cu ayəsi ilə daban-dabana ziddir: "(Ey müsəlmanlar!) Siz insanlar üçün ortaya çıxarılmış ən yaxşı ümmətsiniz (onlara) yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edir və Allaha inanırsınız. Əgər kitab əhli də (sizin kimi) iman gətirsəydi, əlbəttə, onlar üçün yaxşı olardı. Onların da içərisində bəzi iman gətirən şəxslər vardır, lakin çox hissəsi haqq yoldan çıxanlardır."

Dördüncüsü, bu hədis rəsmən təkfirçiliyə rəvac verib müsəlmanları bir-birinə qarşı qaldırır ki, bu da Quranın "Bütün müsəlmanlar qardaşdır" (Hucurat, 10), "Bir-birinizlə çəkişməyin, yoxsa qorxub zəifləyər və gücdən düşərsiniz" (Ənfal, 46) kimi çoxlu ayələrinə, eləcə də Peyğəmbərin "Allan Onun razılığından ötrü (ixlasla, səmimi şəkildə) "La ilahə illəllah" deyənlərə cəhənnəm alovunu haram etmişdir" (Buxari. Əs-Səhih, 2/59, h: 1186), "La ilahə illəllah" deyib mənim Allahın elçisi olduğuma şəhadət verənlər cəhənnəmə daxil olmazlar" (Müslim, 1/61, h: 33 (54)) kimi çoxlu hədislərinə, həmçinin fitnədən uzaq durmağa dair əmrlərinə ziddir. Unutmayaq ki, İftiraq hədisində söhbət Məhəmməd ümmətindən, yəni tövhid və nübüvvəti qəbul edənlərdən gedir, kafir və ya

mürtədlərdən deyil. Bu hədisdən sonra isə təbii ki, hər bir firqə və məzhəb özünü xilas olacaq yeganə firqə elan edib digər müsəlmanların yollarını azdığını və cəhənnəmə gedəcəklərini söyləyər.

Beşincisi, "Mənim və səhabələrimin yolu" nə deməkdir və hansı anlaşılmazlığı həll edir? Məgər səhabələrin hamısı eyni eiqadlara malik olmuş, eyni düşünmüşlər?! Məgər səhabələr arasında müharibə baş verməyib, bir-birini kafir adlandıran, bir-birini lənətləyən olmayıb?! Məgər Qurani-kərim bəzi səhabələri məzəmmət etmir, fasiq və hətta münafiq adlandırmır?! (Bax: Tövbə/101; Hucurat/6; Münafiqun/1-2 və s.) Elə isə Peyğəmbərə aid edilən bu söz onların hansının haqlı olduğunu bildirir və uyğun ixtilaflara nə çarə qılır?!

**Yekun söz**

Deyilənlərdən aydın olur ki, sələflərin – yəni bütün səhabə və tabeilərin yolunun haqq və əməllərinin örnək olmasına dair dəlil yoxdur, bunu nə ağıl təsdiqləyir, nə də tarixi faktlar. Əhli-beyt yolunun haqq və meyar olması isə Quran və sünnəyə istinadla sübut olunur, ağılla və tarixi faktlarla təsdiqlənir.

Beləliklə, Şiəlik Sələfilik kimi digər müsəlmanlara qarşı nifrət aşılayan və təkfirçiliyə meylli saxta hədisləri bayraq edən bir cərəyan olsaydı, etiqadlarını isbatlamağa çətinlik çəkərdi. Lakin o, Peyğəmbərin dövründə bəlli xətləri ilə seçilmiş, Allah rəsulunun ən yaxın adamı olmuş Əliyə və digər Əhli-beytə bağlı bir firqədir, etiqadlarını da Qurandan, Peyğəmbər sünnəsindən və mübahisəli məqamlarda Əhli-beytin açıqlamalarından alır. Şiə etiqadları Qurana zidd olsaydı, nə vəhhabilər körfəz neftinin bitib-tükənməyən pulları və dünyanın ən güclü dövlətlərinin siyasi dəstəyi ilə ona qarşı bu qədər dəridən-qabıqdan çıxar, nə də bu qədər vəhhabi alimi şiə olardı. Şiə etiqadları Qurana zidd olsaydı, İbn Teymiyyə Şiə mütəkəllimi Əllamə Hillinin bircildlik "Minhac əl-kəramə" kitabını səkkiz cildlə

tənqid etməyə çalışmazdı. Görünür Hillinin dəlilləri o qədər də zəif, yaxud vəhhabilərin dediyi kimi, Qurana zidd olmayıb!

Şiə etiqadları Qurana tam uyğun və Quranla isbatı olduqca asandır. Bu baxımdan, ən qərəzli, ən təəssübkeş şiənin də insanların hidayəti üçün nazil edilmiş Allah kitabını sevməməsinə heç bir əsas yoxdur. Əslində, Qurani-kərim Əməvilərə yaxınlığı ilə seçilən sələfilərin etiqadlarına ziddir. Çünki bu müqəddəs kitabda Əhli-beytin adı keçib; hansı ki, Peyğəmbərin özü daxil "Əhli-beyt" kimi təqdim etdiyi 5 nəfərin məhz 3-ü – Əli, Həsən və Hüseyn Əməvilərin zülmü nəticəsində qətlə yetirilmişlər. Çünki bu müqəddəs kitabda Təthir ayəsi var, Peyğəmbər yaxınlarına sevgi vacib buyurulub, rükuda zəkat verənlərin itaəti tapşırılıb, Əliyə Peyğəmbərin özü deyilib və sair.

Təbii ki, əsl Şiəliklə haradasa mövcud olan, kimlərinsə əməlində görünən və ya təsəvvüründə canlanan Şiəlik arasında fərqlər ola bilər. Biz burada Şiə adına bağlanan hər bir etiqad və əməli müdafiə etmək fikrində deyilik. Öz vətənimizdə mövcud olan, xalqın düşüncə və əməllərində görünən Şiəliyi də qüsursuz saymırıq. Lakin bundan sui-istifadə edib Əhli-beyt məzhəbini günahlandıran vəhhabi sələfilərindən fərqli olaraq, 70 illik ateist-marksist təfəkkürünün amansız istismarını, böyük din alimlərinin repressiya qurbanına çevrildiyini, Şiəliyin əsasən məhdud savadlı ruhanilər tərəfindən təbliğ olunduğunu nəzərə alırıq. Bizim dərk etdiyimiz Şiəlik Əhli-beytin məhəbbətini və rəhbərliyini əsas bilməkdən əlavə, hər bir xurafatdan uzaq duran, İslam birliyini prioritet seçən, Peyğəmbər zövcələrini uca tutan, Əhli-sünnəni qardaşı deyil, özü və canı bilən, onun sevdiyi hər bir şəxsin gizli və aşkarda hörmətini saxlayan firqədir. Biz digər düşüncələrə malik insanlarla eyni cəmiyyətdə söyüşmədən-didişmədən, sivil və normal şəkildə yaşamaq mədəniyyətindən məhrum olan bəzi bədəvilərdən fərqli olaraq, digər din və məzhəblərin ardıcıllarını söymür, inanclarını aşağılamır, başa düşürük ki, əvvəlcə insan, müsəlman və sonra şiəyik.

# NƏTİCƏ

Araşdırılan mövzulardan alınan nəticələri qısa şəkildə diqqətinizə çatdırırıq:

1. Şiə mənbələrində Quranın təhrifinə dair nəinki 2000 səhih, heç 2000 zəif hədis də yoxdur. Bəzi əxbarilərin istinad etdiyi hədislərin çox böyük əksəriyyəti, əl-Kafi kitabından gətirdikləri müvafiq sitatların isə heç biri təhriflə əlaqəli deyil. Digər tərəfdən, bu hədislərdə ən pis halda hansısa sözlərin bəzi ayələrdən çıxarılmasından, yaxud dəyişdirilməsindən söhbət gedir, sələfilərin mənbələrində isə bütöv ayələrin, təkcə bir surədən 213 ayənin, hətta bütöv surələrin Qurandan çıxarılması və ya ona əlavə olunması söhbət mövzusudur.

2. Əhli-beyt imamları Quran sözlərinin təhrif edilmədiyini bildirmiş, onun əlavə təfsirlərinin kitaba salınmadığını və bunun da mənəvi təhrifə - yanlış təfsirlərə yol açdığını söyləmişlər. Mehdi zühur edəndə İmam Əlinin topladığı – nazilolma ardıcıllığı ilə yazılmış, bəzi təfsir və izahları olan, söz və ayələrinə görə isə əlimizdəki Qurandan əsla fərqlənməyən kitabı da gətirəcək, onun ən düzgün qiraətini öyrədəcək.

3. Əksər Şiə alimlərinin təhrif düşüncəsində olması ağ yalandır. Əslində, Şiəliyin Əxbarilik və Şeyxilik qollarına mənsub alimlərin bir qismi bu fikirdə olmuşlar. Tarix boyu əsas Şiə alimləri Quranın artma və azalmadan qorunduğunu bildirmiş, elmi dəlillərlə əsaslandırmış və bəlli düşüncədə olanları sərt məzəmmət etmişlər. Bu arada, Quranın təhrif edildiyini düşünən qeyri-şiə alimlər, səhabə və tabeilər də olmuşdur.

4. Bir çox Əhli-sünnə alimlərinə, o cümlədən sələfizmin banisi İbn Teymiyyəyə görə, ciddi şübhə səbəbindən Quranın təhrif edildiyini düşünən İslam alimlərini təkfir etmək olmaz.

5. Tarix boyu bütün şiələr mövcud Qurandan istifadə etmiş, onlarda fərqli Quran olmamış, müxtəlif Quran elmlərinə dair minlərlə kitab yazmışlar. Şiə etiqadları Qurana tam uyğun və Quranla isbatı olduqca asandır. Əslində, Qurani-kərim Əməvilərə yaxınlığı ilə seçilən sələfilərin etiqadlarına ziddir. Çünki bu müqəddəs kitabda Əhli-beytin özəl statusuna dair yetərincə ayə var.

## SON SÖZ, YAXUD QARA PİAR TƏSADÜFDÜRMÜ?

Uzun illərdir şiələrin Quranın təhrifinə etiqad bəsləmələrinə dair tirajı milyonlarla ölçülən kitab, məqalə və broşür çap olunur, Sələfi alimləri alovlu çıxışlar edir, hamını Şiəlik əleyhinə mübarizəyə çağırırlar. Aydın görünür ki, bu kitablarda məqsəd şiələrə yol göstərib "təhrif" fikrindən daşındırmaq yox, onlara qarşı rəy formalaşdırmaq, nifrət yaratmaqdır. Nə üçün? Bəlkə ona görə ki, şiələrin bu etiqadda olmadığını onların özləri çox yaxşı bilirlər. Bəlkə ona görə ki, bu qara piarda əsas məqsəd şiələrə qarşı terror əməliyyatlarına dini əsas formalaşdırmaqdır. Çünki sələfilərə görə, Quranın təhrif olunduğuna inanan hər kəsin boynu vurulmalıdır.

Tarix təkrar olunur. Haqqı batildən ayırd edə bilməyən avam kütlə bir zaman Quranı nizələrdə görüb Əliyə xəncər çəkdi. Bu gün də eyni düşüncə sahibləri Quranı bayraq edənlərin yalançı fəryadlarına aldanıb Əli ardıcıllarını qətlə yetirir. O zaman olduğu kimi, bu gün də Allahın müqəddəs kitabı kimlərinsə dünyəvi məqsədlərinə alət edilir.

Özünü təkfirçi, radikal saymayan sələfilər! İslam inanclarını – şiə və sünnilərin təvəssül, şəfaət, ziyarət, təbərrük kimi etiqadlarını küfr, şirk adlandırmaq təkfirçilik deyilsə, bəs nədir? Nə vaxta qədər müsəlmanlar, ölkəmizdə də əsasən Əhli-beyt firqəsi əleyhinə çirkin kampaniya aparacaq, yalan və iftiralarla onu gözdən salmağa çalışacaqsınız? Hər dəfə yalanlarınıza cavab verildikdən sonra mövzunu dəyişir və növbəti iftiralara keçirsiniz? Sizdə heçmi Allah qorxusu yoxdur?! Sizi bu çirkin işlərə vadar edən nədir: Əhli-beytə nifrət, yoxsa Əməvilərə, nasibilərə məhəbbət?

Bu gün Allahın evi və Peyğəmbərin məzarı siz sələfilərə əmanətdir, hər il dünyanın dörd tərəfindən miyonlarla ziyarətçi qəbul edirsiniz. Bu böyük imkandan, üstəgəl Allahın bəxş etdiyi tükənməz maddi sərvətlərdən necə istifadə edirsiniz?! Bəyənmədiyiniz şiələr – Əhli-beyt ardıcılları həcc mövsümlərində çətinliklə olsa da, müsəlmanların problemlərini qabardır, müsəlman qətliamlarına diqqət çəkir, heç biri şiə olmayan Fələstin məzlumlarına qarşı cinayətlərə etirazını bildirir. Əlinizdə bu qədər imkanlar ola-ola siz bu sahədə nə edirsiniz?! Peyğəmbər ziyarətçilərinə "küfr", "şirk" bağırmaqdan, sizin kimi düşünməyənləri təkfir edən kitab və broşürlər paylamaqdan başqa nə?!

Siz şiə və sünni müsəlmanlardan çox fərqli etiqadlara malik ola, özünüz kimi düşünməyənləri təkfir edə, müsəlmanların birliyini istəyənlərə düşmən münasibət bəsləyə bilərsiniz. Nə edirsinizsə edin, nə olursunuzsa olun, Allahı başınız üstə görün, insaf və mürüvvətdən kənara çıxmayın. Quranın azaldığını düşünənləri kafir sayırsınızsa, ayrıseçkilik etməyin, lap əvvəldən başlayaraq hamısının hökmünü verin. Bunu da etmirsinizsə, ən azı böhtan atmayın, hər kəsi öz etiqad və əməlləri ilə tanıyın, bir neçə nəfərin fikrini bütöv bir məzhəbə aid etməyin.

Şiə olaraq qardaşlığa həmişə hazırıq. Bunun isə sizdən deyil, Mədinədən, Riyazdan asılı olduğunu yaxşı bilirik. Və təəssüf ki, Mədinə təkfirə son qoyacaq qardaşlıq fətvalarında, Riyaz da uyğun siyasətlərdə hələ ki maraqlı görünmür.

Sonda bir daha sizi yalanlardan çəkinməyə çağırırıq. Çünki yalan və iftiralar nəinki başucalığı gətirmir, hətta zəifliyə dəlil sayılır.

"Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançıdırlar!" (Nəhl/105)

"Hər hansı bir camaata qarşı kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır!" (Maidə/8)

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


1. Qurani-kərim.
2. Nəhcül-bəlağə.
3. Albani M. “Silsilə əhadis əs-səhihə”. Yeddi cilddə. “Məktəbə əl-məarif”. Riyaz, 1995-2002. (www.shamela.ws)
4. Alusi M. “Ruh əl-məani”. Tədqiq edən: Əli Əbdülbari Ətiyyə. On altı cilddə. “Dar əl-kutub əl-elmiyyə”. Beyrut, 1415 h.q. (www.shamela.ws)
5. Baqillani M. Əl-İntisar. Tədqiq edən: Məhəmməd İsam əl-Quzat. İki cilddə. “Dar İbn Həzm”. Beyrut, 2001. (www.shamela.ws)
6. Beyhəqi Ə. “Əs-Sünən əl-kubra”. Tədqiq edən: Məhəmməd Əbdülqadir Əta. On cilddə. “Dar əl-kutub əl-elmiyyə”. Beyrut, 2003. (www.shamela.ws)
7. Bəlaği M. “Ala ər-Rəhman fi təfsir əl-Quran”. İki cilddə. Besət. Qum, 1320 h.q. (“Came ət-təfasir” e-kitabxanası)
8. Buxari M. Əs-Səhih. Tədqiq edən: Məhəmməd Züheyr ən-Nasir. Doqquz cilddə. “Tuq ən-nəcat”. Yersiz, 1422 h.q. (www.shamela.ws)
9. Buxari M. “Səhih əl-ədəb əl-müfrəd”. Tədqiq edən: Məhəmməd Nasirəddin Albani. “Dar əs-sədiq”. Yersiz, 1997. (www.shamela.ws)
10. Cəzairi N. “Əl-Ənvar ən-nömaniyyə”. Dörd cilddə. “Dar əl-qari”. Beyrut, 2008. (www.narjes-library.blogspot.com)

11. Əbu Davud S. Əs-Sünən. Tədqiq edən: Məhəmməd Mühyiddin Əbdülhəmid. Dörd cilddə. “Əl-Məktəbə əl-əsriyyə”. Beyrut, tarixsiz. (www.shamela.ws)
12. Əbu Həyyan Andalusi M. “Əl-Bəhr əl-mühit”. Tədqiq edən: Sidqi Məhəmməd Cəmil. On cilddə. “Dar əl-fikr”. Beyrut, 1420 h.q. (www.shamela.ws)
13. Əbu Zöhrə M. “Əl-İmam əs-Sadiq”. Yersiz, tarixsiz. (www.archive.org)
14. Əbülfutuh Razi H. “Rövz əl-cinan”. İyirmi cilddə. “Astani-Qüdsi-Rəzəvi”. Məşhəd, 1408 h.q. (“Came ət-təfasir” e-kitabxanası)
15. Əhməd ibn Hənbəl. Əl-Müsnəd. Tədqiq edən: Şüeyb əl-Ərnəut və digərləri. Qırx beş cilddə. Risalət, 2001. (www.shamela.ws)
16. Əl-Xəmis O. “Hökm Şeyxülislam limən yətəqid təhrif əl-Quran”. (www.almanhaj.net)
17. Əl-Xəmis O. “Əş-Şiə və əl-Quran”. (www.almanhaj.net)
18. Əmini Ə. Əl-Qədir. On bir cilddə. “Dar əl-kitab əl-ərəbi”. Beyrut, 1977. (“Əhli-beyt” e-kitabxanası)
19. Əsgəri M. “Əl-Quran əl-kərim və rivayat əl-mədrəsəteyn”. Tehran universiteti. Tehran, 1999. (www.ahlulbait.gigfa.com)
20. Əs-Seyf M. “Əş-Şiə əl-isna əşəriyyə və təhrif əl-Quran”. Yersiz, tarixsiz. (www.waqfeya.com)
21. Əstərabadi M. “Əl-Fəvaid əl-mədəniyyə”. Tədqiq edən: Rəhmətullah Rəhməti. “Ən-Nəşr əl-islami”. Qum, 1424 h.q. (“Əhli-beyt” e-kitabxanası)
22. Əşəri Ə. “Məqalat əl-islamiyyin”. Frans Ştayz. Viesbaden (Almaniya), 1980. (www.shamela.ws)
23. Əyyaşi M. Təfsir. Tədqiq edən: Haşim Rəsuli Məhəllati. İki cilddə. “Əl-Məktəbə əl-elmiyyə əl-islamiyyə”. Tehran, tarixsiz. (“Əhli-beyt” e-kitabxanası)

24. Feyz Kaşani M. “Əl-Əsfa fi təfsir əl-Quran”. Tədqiq edən: Məhəmmədhüseyn Dirayəti və Məhəmmədrza Neməti. İki cilddə. İslam Təbliğatı. Qum, 1418 h.q. (“Came ət-təfasir” e-kitabxanası)
25. Feyz Kaşani M. Əl-Vafi. İyirmi altı cilddə. İmam Əli kitabxanası. İsfahan, 1406 h.q. (“Came əl-əhadis” e-kitabxanası)
26. Feyz Kaşani M. “Təfsir əs-safi”. Tədqiq edən: Hüseyn Ələmi. Beş cilddə. Əs-Sədr. Tehran, 1415 h.q. (“Came ət-təfasir” e-kitabxanası)
27. Fəzl ibn Şazan. Əl-İzah. Tədqiq edən: Cəlaləddin Hüseyni. Tehran, 1972. (“Əhli-beyt” e-kitabxanası)
28. Hakim Nişaburi M. Əl-Müstədrək. Tədqiq edən: Mustafa Əbdülqadir Əta. Dörd cilddə. “Dar əl-kutub əl-elmiyyə”. Beyrut, 1990. (www.shamela.ws)
29. Hilli H. “Əcvibə əl-məsail əl-məhnaiyyə”. Xəyyam. Qum, 1401 h.q. (www.rafed.net)
30. Hürr Amili M. “Təvatür əl-Quran”. “Dar əl-kutub əl-islamiyyə”. Tehran, tarixsiz. (www.noorlib.ir)
31. Hürr Amili M. “Vəsail əş-Şiə”. Otuz cilddə. Alul-beyt. Qum, tarixsiz. (“Əhli-beyt” e-kitabxanası)
32. Xətib Bağdadi Ə. “Tarix Bağdad”. Tədqiq edən: Bəşşar Əvvad Məruf. On altı cilddə. “Dar əl-qərb əl-islami”. Beyrut, 2002. (www.shamela.ws)
33. Xətib M. “Əl-Xütut əl-ərizə”. Yersiz, tarixsiz. (www.shamela.ws)
34. Xoi Ə. “Əl-Bəyan fi təfsir əl-Quran”. “Dar əz-Zəhra”. Beyrut, 1975. (“Əhli-beyt” e-kitabxanası)
35. Xomeyni R. “Ənvar əl-hidayə”. İki cilddə. “Əl-Elam əl-islami”. Qum, 1993. (“Əhli-beyt” e-kitabxanası)
36. İbn Cibrin A. “Əl-Lölö əl-məkin” fətvaları. (www.ibn-jebreen.com)

37. İbn Əbdülbirr Y. Ət-Təmhid. Tədqiq edən: Musrafa Ələvi və Məhəmməd Bəkri. İyirmi dörd cilddə. Vəqflər nazirliyi. Mərakeş, 1387 h.q. (www.shamela.ws)
38. İbn Əbu Davud A. Əl-Məsahif. Tədqiq edən: Məhəmməd ibn Əbdüh. "Əl-Faruq əl-hədisə". Qahirə, 2002. (www.shamela.ws)
39. İbn əl-Cəzri M. "Ən-Nəşr fi əl-qiraat əl-əşr". Tədqiq edən: Əli Məhəmməd Zəbba. İki cilddə. "Dar əl-kitab əl-elmiyyə". (www.shamela.ws)
40. İbn əl-Məğazili Ə. "Mənaqib Əli". Tədqiq edən: Əbu Əbdürrəhman Vadei. "Dar əl-asar". Səna, 2003. (www.shamela.ws)
41. İbn Ərəbi M. "Əl-Futuhat əl-məkkiyyə". Dörd cilddə. "Dar sadir". Beyrut, tarixsiz. ("Əhli-beyt" e-kitabxanası)
42. İbn Əsir M. "Ən-Nihayə fi ğərib əl-hədis vəl-əsər". Tədqiq edən: Tahir Əhməd əz-Zavi və Mahmud Məhəmməd ət-Tənahi. Beş cilddə. "Əl-Məktəbə əl-elmiyyə". Beyrut. 1979. (www.shamela.ws)
43. İbn Həcər Ə. "Fəth əl-bari". On üç cilddə. "Dar əl-mərifə". Beyrut, 1379 h.q. (www.shamela.ws)
44. İbn Həzm Ə. "Əl-Fəsl fi əl-miləl". Beş cilddə. Əl-Xanici. Qahirə, tarixsiz. (www.shamela.ws)
45. İbn Xəllikan Ə. "Vəfəyat əl-əyan". Tədqiq edən: Ehsan Abbas. Yeddi cilddə. "Dar sadir". Beyrut, 1994. (www.shamela.ws)
46. İbn Xətib M. "Əl-Furqan". "Dar əl-kutub əl-elmiyyə". Beyrut, tarixsiz. ((www.islameyat.com))
47. İbn Kəsir İ. Təfsir. Tədqiq edən: Sami ibn Məhəmməd. Səkkiz cilddə. "Dar Teybə". Yersiz, 1999. (www.shamela.ws)
48. İbn Nədim M. Əl-Fihrist. Tədqiq edən: İbrahim Ramazan. "Dar əl-mərifə". Beyrut, 1997. (www.shamela.ws)

49. İbn Nüceym Z. “Əl-Bəhr ər-raiq”. Səkkiz cilddə. “Dar əl-kitab əl-islami”. Yersiz, tarixsiz. (www.shamela.ws)
50. İbn Səd M. “Ət-Təbəqat əl-kubra”. Tədqiq edən: Məhəmməd Əbdülqadir Əta. Səkkiz cilddə. “Dar əl-kutub əl-elmiyyə”. Beyrut, 1990. (www.shamela.ws)
51. İbn Şəhr Aşub. M. “Mütəşabih əl-Quran və müxtəlifuh”. İki cilddə. Bidar. Qum, tarixsiz. (www.noorlib.ir)
52. İbn Teymiyyə Ə. “Məcmu əl-fətava”. Tədqiq edən: Əbdürrəhman ibn Məhəmməd. Otuz beş cilddə. Məlik Fəhd. Mədinə, 1995. (www.shamela.ws)
53. İbn Teymiyyə Ə. “Minhac əs-sünnə”. Tədqiq edən: Məhəmməd Rəşad Salim. Doqquz cilddə. İmam Məhəmməd ibn Səud universiteti. Riyaz, 1986. (www.shamela.ws)
54. İbn Şöbə Hərrani H. “Tuhəf əl-uqul”. “Ən-Nəşr əl-islami”. Qum, 1984. (“Əhli-beyt” e-kitabxanası)
55. Ehsan İlahi Zəhir. “Əş-Şiə və əl-Quran”. “Tərcüman əs-sünnə”. Lahur, 1403 h.q. (www.shamela.ws)
56. Kaşani M. “Təfsir əl-muin”. Tədqiq edən: Hüseyn Dərgahi. Mərəşi Nəcəfinin kitabxanası. Qum, 1410 h.q. (“Came ət-təfasir” e-kitabxanası)
57. Kaşif əl-ğita C. “Əl-Həqq əl-mubin”. www.ekhbarion.com
58. Kaşif əl-ğita C. “Kəşf əl-ğita”. İki cilddə. Məhdəvi. İsfahan, tarixsiz. (“Əhli-beyt” e-kitabxanası)
59. Kaşif əl-ğita M. “Əsl əş-Şiə və üsuluha”. Tədqiq edən: Əla Ali-Cəfər. İmam Əli mərkəzi. Yersiz, 1415 h.q. (“Əhli-beyt” e-kitabxanası)
60. Kuleyni M. Əl-Kafi. Tədqiq edən: Əliəkbər Qəffari. Səkkiz cilddə. “Dar əl-kutub əl-islamiyyə”. Tehran, 1363 h.q. (“Əhli-beyt” e-kitabxanası)
61. Qəfari N. “Üsul məzhəb əş-Şiə əl-İmamiyyə”. Üç cilddə. Yersiz, 1414 h.q. (www.shamela.ws)

62. Qərzavi Y. "Əs-Səhvə əl-islamiyyə". "Dar əş-şuruq". Qahirə, 2001. (www.fichier-pdf.fr)
63. Qəzzali M. "Difa ən əl-əqidə və əş-şəriə". "Nəhzət Misr". Qahirə, 2005. (www.uqu.edu.sa)
64. Qumi Məşhədi M. "Kənz əd-dəqaiq". On dörd cilddə. Tədqiq edən: Hüseyn Dərgahi. İslam İrşad. Tehran, 1989. ("Came ət-təfasir" e-kitabxanası)
65. Qurtubi M. Təfsir. İyirmi cilddə. Tədqiq edən: Əhməd Bərduni və İbrahim Əttəfəyyəş. "Dar əl-kutub əl-misriyyə". Qahirə, 1964. (www.shamela.ws)
66. Malik ibn Ənəs. Əl-Müvəttə. Tədqiq edən: Məhəmməd Mustafa Əzəmi. Səkkiz cilddə. Zayid ibn Sultan. Əbu Dabi, 2004. (www.shamela.ws)
67. Malullah M. "Əş-Şiə və təhrif əl-Quran". "Dar əl-vəy ə-islami". Beyrut, 1982. (www.waqfeya.com)
68. Mazandarani M. "Şərh əl-Kafi". Tədqiq edən: Əbülhəsən Şərani. On iki cilddə. "Əl-Məktəbə əl-islamiyyə". Tehran, 1382 h.q. ("Came əl-əhadis" e-kitabxanası)
69. Məclisi M. "Mirat əl-üqul". Tədqiq edən: Haşim Rəsuli Məhəllati. İyirmi altı cilddə. "Dar əl-kutub əl-islamiyyə". Tehran, 1404 h.q. ("Came əl-əhadis" e-kitabxanası)
70. Mədəni M. "Rəccə əl-bəs". "Risalə əl-İslam" jurnalı. Qahirə. İl: 11 (1959), say: 4 (44). (www.noormags.com)
71. Məhəmməd ibn Əbdülvəhhab. "Ər-Rədd əla ər-Rafizə". Tədqiq edən: Nasir ibn Səd ər-Rəşid. İmam Məhəmməd ibn Səud universiteti. Riyaz, tarixsiz. (www.shamela.ws)
72. Mərifət M. "Siyanə əl-Quran min ət-təhrif". Ət-Təmhid. Qum, 2007. (www.noorlib.ir)
73. Möhsün Əmin. "Əyan əş-Şiə". Tədqiq edən: Həsən Əmin. On cilddə. "Dar ət-təaruf". Beyrut, tarixsiz. ("Əhli-beyt" e-kitabxanası)

74. Mücahid ibn Cəbr. Təfsir. Tədqiq edən: Məhəmməd Əbdüssalam. "Dar əl-fikr əl-islami". Misir, 1989. (www.shamela.ws)
75. Müfid M. Əl-İrşad. İki cilddə. "Dar ə-Müfid". Beyrut, 1993. ("Əhli-beyt" e-kitabxanası)
76. Müfid M. "Əl-Məsail əs-sərəviyyə". Tədqiq edən: Saib Əbdülhəmid. "Dar əl-Müfid". Beyrut, 1993, 78. ("Əhli-beyt" e-kitabxanası)
77. Müfid M. "Əvail əl-məqalat". Tədqiq edən: İbrahim Ənsari. "Dar əl-Müfid". Beyrut, 1993. ("Əhli-beyt" e-kitabxanası)
78. Mürtəza Ə. Əz-Zəriə. Tədqiq edən: Əbülqasim Gürci. İki cilddə. Tehran universiteti, 1967. ("Əhli-beyt" e-kitabxanası)
79. Mürtəza Ə. "Əz-Zəxirə fi elm əl-kəlam". Tədqiq edən: Əhməd Hüseyni. "Ən-Nəşr əl-islami". Qum, 1411 h.q. (www.noorlib.ir)
80. Müslim ibn Həccac. Əs-Səhih. Tədqiq edən: Məhəmməd Fuad Əbdülbaqi. Beş cilddə. "Dar ihya ət-turas əl-ərəbi". Beyrut, tarixsiz. (www.shamela.ws)
81. Mütəhhəri M. İslam və zamanın tələbləri. (www.kitab.nur-az.com)
82. Nəccarzadeqan F. Quranın təhrifdən qorunması haqda sual-cavablar. (www.noormags.com)
83. Nəcd alimləri. "Əd-Dürər əs-səniyyə". Tədqiq edən: Əbdürrəhman ibn Məhəmməd. On altı cilddə. Yersiz, 1996. (www.shamela.ws)
84. Nəhhas Ə. "Ən-Nasix və əl-mənsux". Tədqiq edən: Məhəmməd Əbdüssalam. Əl-Fəlah. Küveyt, 1408 h.q. (www.shamela.ws)
85. Nəsai Ə. Əs-Sünən. Tədqiq edən: Əbdülfəttah Əbu Qüddə. Doqquz cilddə. "Əl-Mətbuat əl-islamiyyə". Hələb, 1986. (www.shamela.ws)

86. Nuri H. “Fəsl əl-xitab fi təhrif kitabi-Rəbb əl-ərbab”. Daş çapı. Yersiz, 1298 h.q. (www.islameyat.com)
87. Rəhmətullah Hindi M. “İzhar əl-Həqq”. Dörd cilddə. İfta, Dəvət və İrşad idarəsi. Səudiyyə Ərəbistanı, 1989. (www.shamela.ws)
88. Seyid ibn Tavus Ə. “Səd əs-süud”. Ər-Rəzi. Qum, 1984. (“Əhli-beyt” e-kitabxanası)
89. Sədra M. “Əl-Hikmə əl-mütəaliyə”. Doqquz cilddə. “Dar ihya ət-turas”. Beyrut, 1981. (“İslam hikməti” e-kitabxanası)
90. Səduq M. Əl-Etiqadat. Tədqiq edən: İsam Əbdüsseyid. “Dar əl-Müfid”. Beyrut, 1993. (“Əhli-beyt” e-kitabxanası)
91. Sənani Ə. Əl-Müsənnəf. Tədqiq edən: Həbibürrəhman əl-Əzəmi. On bir cilddə. “Əl-Məclis əl-elmi”. Hindistan, 1403 h.q. (www.shamela.ws)
92. Sübhi Saleh İ. “Məbahis fi ülum əl-Quran”. “Dar əl-elm lil-məlayin”. Yersiz, 2000. (www.shamela.ws)
93. Süyuti C. “Əd-Durr əl-mənsur”. Səkkiz cilddə. “Dar əl-fikr”. Beyrut, tarixsiz. (www.shamela.ws)
94. Süyuti C. “Əl-İtqan fi ülum əl-Quran”. Tədqiq edən: Məhəmməd Əbülfəzl İbrahim. Dörd cilddə. “Əl-Heyət əl-misriyyə”. Misir, 1974. (www.shamela.ws)
95. Şərani Ə. “Əl-Kibrit əl-əhmər”. “Dar ihya ət-turas əl-ərəbi”. Beyrut, tarixsiz. (www.noorlib.ir)
96. Şüştəri N. “Məsaib ən-nəvasib”. “Müəssisə Qaid”. Yersiz, 1426 h.q. (www.narjes-library.blogspot.com)
97. Təbatəbai M. “Təfsir əl-mizan”. İyirmi cilddə. “Camiə əl-müdərrisin”. Qum, tarixsiz. (“Əhli-beyt” e-kitabxanası)
98. Təbəri M. Tarix. On bir cilddə. “Dar ət-turas”. Beyrut, 1387 h.q. (www.shamela.ws).
99. Təbəri M. Təfsir. Tədqiq edən: Əhməd Məhəmməd Şakir. İyirmi dörd cilddə. Ər-Risalə. Yersiz, 2000. (www.shamela.ws)

100. Təbrisi F. "Məcmə əl-bəyan". Əl-Ələmi. Beyrut, 1995. ("Əhli-beyt" e-kitabxanası)
101. Tirmizi M. Əs-Sünən. Tədqiq edən: Bəşşar Əvvad Məruf. Altı cilddə. "Dar əl-qərb əl-islami". Beyrut, 1998. (www.shamela.ws)
102. Tusi M. "Ət-Tibyan fi təfsir əl-Quran". Tədqiq edən: Əhməd Həbib Amili. On cilddə. "Əl-Elam əl-islami". Yersiz, 1409 h.q. ("Əhli-beyt" e-kitabxanası)
103. Zəhəbi M. "Tarix əl-İslam". Tədqiq edən: Ömər Əbdüssalam. Əlli iki cilddə. "Dar əl-kitab əl-ərəbi". Beyrut, 1987. ("Əhli-beyt" e-kitabxanası)
104. Zərkəşi M. "Əl-Burhan fi ülum əl-Quran". Tədqiq edən: Məhəmməd Əbülfəzl İbrahim. Dörd cilddə. "Dar ihya əl-kutub əl-ərəbiyyə". Beyrut, 1957. (www.shamela.ws)